# Mündəricat

## SUAL–CAVAB ۲۸

### KİTAB HAQQINDA

Kitabın adı:۲۸ sual–cavab

:Müəllif

Naşir:Şəhriyar

Çap tarixi:۲۰۰۹

Səhifələrin sayı:۷۳

Çap növbəsi:Birinci

Tirajı:۳۰۰۰

səh:۱

### SUAL ۱–۱

SUAL ۱-۱: Hörmətli Ayətullah-üzma Safi həzrətləri, salam! Bir qrup şəxs «Şəms» surəsində Allahın nəfsin paklığına on bir dəfə and içməsini əsas götürərək nəfsin ?paklanmasını vacib bilmişlər. Bu düzgündürmü

CAVAB: Nəfsi saflaşdırmaq, paklamaq vacibdir. «Onu paklayan nicat tapar» (Şəms-۹) .ayəsinə müvafiq olaraq nəfsini paklayanlar nicat tapasıdırlar

İslamın e’tiqad, əxlaq və ibadət bölmələrinə aid proqramlarda əxlaqın zinətləndirilməsinə xüsusi yer verilmişdir. Batinə səfa verilməsində, qəlb çirkinliklərinin təmizlənməsində bu proqramlar olduqca tə’sirlidir. Ali islam tə’limlərinin bir hissəsi paklıq və saflıq, digər bir hissəsi isə kamillik və zinətlənmədir. Bu iki yönümün faydası .bütün dini tə’limlərdə təsdiqlənir

Əxlaqın paklaşdırılmasında insan özü aparıcı rol oynayır. Vəzifələrin, ibadətlərin icrası, günahın tərk edilməsi ardıcıllıqla yerinə yetirilərsə, batinin nuru artar və Allaha üz tutmaqla qəlb aydınlaşar. Əksinə, günah və haramlar, dini göstərişlərə e'tinasızlıq .qəlbi qaraldır, ruhu korlayır

Beləcə, din Allaha üz tutmaq, paklamaq, zinətlənmək, kamilləşməkdir. «Hər bir mö'min kişi və qadın yaxşı işlər görərsə, onu pak həyatda yaşadar, əməllərinin əvəzini daha artıq verərik.» (Nəhl-۹۷). Bu əməllər bəyənilmiş həyata səbəb olur və insan elm və əməl .qanadı ilə bu ali məqamlara yetişir

Qur'an və Əhli-beyt hədislərini qoyub, onun-bunun sözünə əməl etmək və rəhbər, şeyx seçmək lazım deyil. Bə'ziləri gərəksiz olaraq Allaha yaxınlaşmaq adı altında təriqət və qruplar yaradır, hətta alimləri də müəyyən dəstələrə bölürlər. Əsassız .proqramlar islam adı ilə qələmə verilir

Bütün kitabların (məsələn, Şeyx Tusinin «Misbahul-mutəhəccid» kitabı) göstərdiyi yaxınlaşma yolu vacibatlardan, nafilələrdən, insanları yaxşıya də'vət edib, pisdən çəkindirməkdən, «İslam» kəlməsini ucaltmaqdan, mö'minlərin ehtiyacını ödəməkdən, həzrət

.Mehdinin (ə) zühurunun həqiqi intizarında olmaqdan ibarətdir

.Allah-taala hamını Öz dininə, doğru yol olan islama hidayət etsin

### SUAL ۱–۲

SUAL ۱-۲: Deyirlər ki, mə'nəvi kamilliyə çatmaq istəyən şəxs dua və zikrləri dərman misalında bilib, onları ruhani təbibin nəzarəti altında istifadə etməlidir. Çünki dualar ?ruhi təbəqələrə malikdir. Bu doğrudurmu

CAVAB: Deyilən məqsədə çatmaq üçün Əllamə Məclisinin kitablarından, Tusinin «Misbahından», «Məfatihul-cinan»dan dua və zikrlər oxunsa kifayətdir. Xüsusi bir icazə və göstərişə ehtiyac yoxdur. İcazəyə ehtiyaclı bilindirilən bə'zi sufi proqramları əsassızdır. Bə'zən isə bu proqramların müəyyən qismləri bid'ət və haramdır. Ən əsası odur ki, ibadət və təkliflər proqramı şəriət və mə'sumlara əsaslansın. İnsan kimlərinsə .ixtiralarına tabe olmamalıdır

### SUAL ۲

SUAL ۲: Şiələrin uca məqamlı müctəhidi həzrət Ayətullah-üzma Safinin mübarək !hüzuruna salam

Yaşayış mühitim çətinləşib. Səbəb ailə üzvlərinin islami vəzifə və göstərişlərə məs'uliyyətsizliyidir. Evi tərk edib, başqa bir yerdə şər'i vəzifələrimi rahatlıqla yerinə yetirmək istəyirəm. Yaddaşımın zəifliyi də narahatçılıq yaradır. Bu iki çətinlikdə

.dəyərli nəsihətlərinizlə yol göstərməyinizi xahiş edirəm

.CAVAB: Bismillahir-rəhmanir-rəhim

Yazdığınız əlimizə çatdı. Allahdan çətinliklərinizin gözəl şəkildə həllini və sizin üçün .xeyir aqibət istəyirəm

Sizin əhkam və şər'i vəzifələrə diqqətiniz bəyəniləsidir. Həzrət Bəqiyyətullahın (ə.c) .lütfü sizə şamil olsun, inşaəllah

Ailəniz dini vəzifələri hələlik lazım olan şəkildə yerinə yetirməsə də, siz müqavimət göstərin. Zənnimcə, təhsilinizi bitirməmiş yaşayış şəraitinizi dəyişsəniz, yeni .çətinliklərlə qarşılaşacaqsınız

İlkin islam dövrünü və o dövrün müsəlmanlarını xatırlayın. O zaman gənclər kafir ailələr içində müsəlman olur və xeyli əzab-əziyyətlə qarşılaşırdılar. Mə'yus olmayın. .İnşaəllah müvəffəq olarsınız

Hafizənizin zəifliyi də qorxulu deyil. Bir çox iste'dadlı şəxsiyyətlərin hafizəsi zəif olub. .Allah sizə kömək olsun

## SUAL ٣

SUAL ٣: Ayətullah-üzma hacı şeyx Lütfüllah Safini həzrətlərinə. Salam! Böyük şəxsiyyətlərlə ünsiyyətdə olduğunuzu nəzərə alaraq, sizdən dünya və axirət səadətinə yol açan bir nəsihət səh:۶

.(istəyirəm. «Nəsihət mö'minlər üçün faydalıdır.» (Zariyat-۵۵

.CAVAB: Bismillahir-rəhmanir-rəhim

Aləm və onda olan hər bir şey, bütün hadisələr, ilin dövrü, ömrün və gecə-gündüzün keçməsi, yer və göy, yoxsulluq və varlılıq, sağlamlıq və xəstəlik, cavanlıq və qocalıq, həyat və ölüm, zillət və izzət, bütün gördüklərimiz, hər hansı bir şeyin vücuda gəlməsi .və boya-başa çatması, ölümə qədər olan dəyişikliklərin hər biri öyüd və nəsihətdir

Əgər insan aləmə ibrət gözü ilə baxarsa dünyanın zahirinə diqqət yetirməklə onun batini haqda düşünərsə, şübhəsiz öz vücudunda oyanış hiss edər. İnsan üçün imkan aləminin hər bir zərrəsində, hər bir yarpaqda mə'rifət qapıları və səadət yolları açılar. Bir şərtlə ki, insan aşağıdakı ayələrin şamil edildiyi qrupdan olsun: «Yerləri və göylərin yaranışı haqqında düşün – Pərvərdigara bunları əbəs yerə yaratmamısan» (Ali-İmran-۱۹۱). Əksinə, bu ayədə göstərilən sifətdən uzaq ola: «Ürəkləri var, onunla dərk etməz, .(gözləri var, onunla görməzlər, qulaqları var, onunla eşitməzlər» (Ə'raf-۱۷۹

Yaranış kitabı olan dünya başdan-başa nəsihət və moizələrlə zəngindir. Lakin oxumaq üçün savad, mə'naların dərki üçün ağıl gərəkdir. Böyük vəhy

və şəriət kitabı olan Qur’ani-kərim də, yaranış aləmi kimi nəsihətlərdən ibarətdir. Onu çox oxuduqca, mə’nalarını ’çox düşündükcə daha çox ibrət götürülür. İstənilən bir .sahədə nəsihəti Qur’andan tapa bilərsiniz

Əbdür-rəhmanın sifətlərini mübarək «Fürqan» surəsindən, ictimai-əxlaqi tə’limləri «İsra» surəsinin ۲۲-۳۹-cu ayələrindən oxuya bilərsiniz. Onun müjdə verən, qorxudan ayələrinin hər biri nəsihətamizdir. Sol və sağ tərəfdən olanların sifətlərinin bəyanı .olduqca nəsihətlidir

Peyğəmbərlərin və ilahi şəxslərin, eləcə də kafirlərin və fir’onların aqibəti doğru yola yönəlmək üçün öyüd və nəsihətdir. Oxuyun, təkrarlayın və mə’nalarını düşünün. Çalışın ki, bu mə’naların həqiqətini əldə edəsiniz. «Bu axirət mənzilidir. Onu yer üzündə azğınlıq, tüğyan etmək istəməyənlər üçün sabit etmişik və yaxşı aqibət təqva .(sahiblərinindir» (Qəsəs-۸۳

Onlara bu dünya həyatını misal gətir – o, göydən yağan və cürbəcür bitkilər cücərdən » .(yağış kimidir. Allah hər bir işə qadirdir» (Kəhf-۴۵

Hər kəs zərrəcə yaxşılıq etsə, yaxşılıq, hər kəs zərrəcə pislik etsə, pislik görər» (Zilzal» .(۷-۸

.(Göylərdə və yerdə baxılmayıb, ötürülən bir çox nişanələr var» (Yusif-۱۰۵»

səh:۸

Özlərindən sonra necə bağlar və bulaqlar qaldı – əkinlər, gözəl evlər və içində qərq»
.(olduqları bir ne’mət» (Duxan ۲۵, – ۲۷

İllər boyu onları faydalandırdığımıza baxmayaraq, və’d olunmuş əzabın başlarına»
.(yağdığını gördün. Həmin faydalar onlara tə’sir etmədimi?» (Şuəra ۲۰۵, ۲۰۶, ۲۰۷

Xülasə, aydınlıq istəyənlər üçün Qur’an bütün qaranlıqları işıqlandırası bir nurdur. Əgər ərəb dili ilə tanışlığınız yoxdursa, düzgün tərcümələrdən istifadə edin. Qur’anla yanaşı həzrət Peyğəmbərin (s) moizə və nəsihətlərini, «Nəhcül-bəlağədən» həzrət .Əlinin (ə) xütbələrini, Qur’anın həqiqi şərhçilərinin nəsihətlərini mütaliə edin

İmkan həddində mö’min bacı və qardaşlarınızın hüququna riayət edin. Zəif .təbəqələrin ehtiyacını ödəməyə çalışın. Cəmiyyəti, dini yığıncaqları tərk etməyin

Gecə namazını qənimət bilin. Hər zaman Allahı zikr edin. Cümə axşamları «Kumeyl», .cümə günləri isə «Nudbə» duası oxuyun

Öz şəxsi əməl və hesabınızın mühasibəsində alverdə şəriklərin hesabında olduğundan da ciddi olun. Hədisdə buyurulur: «Hər kəs özü ilə gündəlik hesabat aparmasa, bizdən deyil.» Əgər hesabatdan yaxşı iş alınsa, Allah bu şəxsin həmin

işlərini artırar. Əksinə, günah iş alınsa, həmin şəxs tövbə edib, Allahdan bağışlanmaq .(istəməlidir. (Kuleyni «Kafi» ۲-ci cild

.Niyyətinizi xalisləşdirin, özünüzü Allah və Onun savabından qeyri bir şeyə satmayın

İmkan aləminin nümunə və hidayətçisi həzrət Bəqiyyətullah (ə.c.) ilə rabitənizi qoruyun. Onun hakimiyyəti altında olduğumuzu, ona rəiyyət olduğumuzu unutmayın. İşlərimizi bacardıqca onların öhdəsinə qoyaq, onların ali məqsədlərinə itaət edək. O həzrətin (imam Zaman (ə.c.)) zühurunun intizarını çəkənləri, onun dostlarını sevək. Yalnız Əhli-beytə itaətlə əldə edilən uca məqama yüksələcəyinizi ümid edirəm. Allah sizləri, bizləri, və bütün mö'minləri ins və cindən olan şeytanların, bid'ətçilərin .tələlərindən qorusun

## SUAL ۴

SUAL ۴: Hörmətli müctəhid Ayətullah-üzma Safi Gülpayiqani ağanın hüzuruna! Haqqa çatmaq üçün bir göstəriş buyurun. Bu hədəfə nail olmaq üçün özümə rəhbər, şeyx ?seçimmi? Hansı kitabı məsləhət görürsünüz

.CAVAB: Bismillahir-rəhmanir-rəhim

Məktubunuz çatdı və onun məzmunundan mə'lumat hasil oldu. Əxlaqı paklamaq və sizin sözünüzlə desək, Allaha tərəf getmək üçün

göstəriş istəmisiniz. Yadınıza salıram ki, İslam tə'limlərinə, vacib və müstəhəbbə əməl .etmək, haram və məkruhdan çəkinmək haqqa tərəf getmək deməkdir

Hər bir müsəlman Allaha tərəf gedir, amma bu hərəkətdə onlar dərəcə və rütbəcə fərqlənirlər. İnsan Allah və şəriət göstərişlərinə diqqətli olduqca daha çox müvəffəqiyyətə çatır. İbadi tə'limlər, namaz, həcc, oruc, dua, Qur'an oxumaq, gecə namazı, nafilələrə diqqət, cümə gününün və gecəsinin ibadətləri, qeybət və yalanın tərki, nəfs ilə hesab, bəndələrin ehtiyacını ödəmək, ata-anaya yaxşılıq, qohum-əqrabanı yoxlamaq, qonşuya yaxşılıq, əmanətdarlıq, alimlərlə ünsiyyətdə olmaq, tövbəni təzələmək, təkbir, təhmid, təsbih, təhlil zikrləri, xalqla xoş rəftar, insanları yaxşıya də'vət edib, pisdən çəkindirmək, rəvayətdə (Muəlla ibni Xuneysin rəvayətində) deyildiyi həddə din qardaşlarının hüquqlarına riayət, bədən üzvlərini günahlardan qorumaq, hətta şübhəli işlərdən çəkinmək, yaranışda Allahın qüdrət və əzəmətini düşünmək, Qur'ani-məciddə bəyan olunmuş dağlar və dənizlərə, böyük və kiçik mövcudata ibrət gözü ilə baxmaq – bütün bu sadalananlar Allaha tərəf .hərəkətdir

Bu hərəkətin qayda-qanunları dua kitabları, risalələr, Qur'anın təfsirləri və hədis kitablarında göstərilmişdir. Şeyx və rəhbərə ehtiyac yoxdur. Ustad Qur'an və Əhli-beytdən olan hədislərdir.

Xülasə, bütün müsəlmanlar beş namaz vaxtı Allaha tərəf səfərdədirlər. Qadın öz evdarlığı və şər'i vəzifələrini yerinə yetirməklə, kişi alın təri ilə ruzi qazanmaqla uyğun səfərdə ola bilər. Lakin «...qafillərdən olma...» (Ə'raf-٢٠٥) ayəsinə əməl edilməlidir. Bütün bu əməllərdə Allahın razılığı gözlənilməli, Allah unudulmamalıdır.

İslam tə'limlərinin bərəkətindən yol açıqdır. Hətta günahlar yolu bağladıqda belə, tövbə ilə yenidən açılır.

Yaxşıya də'vəti, pisdən çəkindirməni tərk edən, cəmiyyətdən uzaqlaşıb bir güncdə oturan adamlar yol göstərə bilməzlər. Yola bələd Əhli-beyt məktəbinin şagirdləri və alimləridir. İşarə etdiyiniz həmin firqədən qorunun. Həmin yol küfr və şirkə aparır. Onların rəhbərlikdə məqsədi xalqı azdırmaqdır.

Qardaşcasına nəsihət edirəm: əvvəl vaxtda namaz qılmaqla, dilinizi qorumaqla, deyilən proqramlara baxmaqla, elə öz ayağınızla Allaha tərəf getsəniz, Ona yaxın olarsınız.

Yolumuzda çalışanları bu yola hidayət edərik və Allah yaxşı iş görənlərlədir» (Ənkəbut- « .(۶۹

Mən sizin müvəffəqiyyət qazanmağınız və imanınızın şeytanların vəsvəsəsindən .qorunması üçün dua edirəm. Siz də məni unutmayın

**SUAL ۵**

SUAL ۵: Şiələrin uca məqamlı müctəhidi Ayətullah-üzma Safinin hüzuruna, ədəb və ?ixlas ilə! Ruhi sarsıntı və uğursuzluqdan qurtulmaq üçün nə etmək lazımdır

.CAVAB: Bismillahir-rəhmanir-rəhim

.Ruhi halətlər və müvəffəqiyyətlərin kəsilməsindən danışan məktubunuz gəlib çatdı

Nəfsdən şikayətlənən ruhiyyə, ruhani mənbələrə diqqət, mə'nəvi ziyanlardan narahatlıq özü qəlbin diriliyi və fikrin ayıqlığıdır. Qəflət halətinin əksi olan nəfsi .danlamaq batinin islahında çox tə'sirlidir

Şərafətli bir hədisə görə, uzun illər ibadətlə məşğul olmuş bir şəxs var idi. Bu şəxs o zamanın adət-ən'ənəsi ilə qurban kəsdi və bu qurban qəbul olmadı. O, öz nəfsinə üz tutub dedi: «Başıma nə gəldisə, səndən gəldi. Günahkar deyildim, sən etdin.» Xitab oldu .ki, bu şəxsin öz nəfsini danlması illərlə etdiyi ibadətdən daha yaxşıdır

Siz hazırkı imanınız ilə həmin ləyaqətli halətə sahib olmalı, savabın əldə verilməsindən

narahatlıq keçirməlisiniz. Buna görə də ötən zərərlərin aradan qaldırılması məqamına gəlin və Allaha şükr edin ki, sizə belə bir işıqlı vicdan vermişdir. Şükr edə-edə, şadlıq və eşqlə öz proqramlarınızın icrasına başlayın. Allahdan mərhəmət və yardım diləyin. .İnşəallah, halınız yaxşılaşacaq, qəlbinizin nuraniliyi, batininizin saflığı artacaq

Hər bir bəndə öz nəfsani halətlərini nəzarət altında saxlamalıdır. Hədisdə var: «Qəlb də dəmir kimi paslanır və Qur’an oxumaqla, ölümü yada salmaqla təmizlənir.» .((«Əlmühəccətül-beyza» ۲-ci cild

Əgər bacarsanız, öz nəfsinizi cərimə edin. Allahın itaət və razılığı yolunda onu təzyiq altında saxlayın. Bu işlərdən əlavə, malınızdan infaq edin, çox namaz qılın, Qur’an oxuyun. Bə’zi böyük şəxsiyyətlərin haqqında deyilib ki, namazı əvvəl vaxtdan .gecikdirəndə özünü ədəbləndirmək üçün bir qul azad edərdi

Əbu-həmzə Somalinin dualarından bu seçilmiş cümlələri oxuyun və işinizdə eyb varsa, .onu düzəldin

Ey mənim Allahım! Hər zaman ki, öz batinimi islah edib, tövbəkarlara yaxın olmaq» istədimsə, qarşıya bir çətinlik çıxdı və məndən sabit qədəmliyi aldı. Sənin xidmətində olmaqdan

kənar düşdüm. Mənim ağam! Bəlkə məni öz dərgahından qovub, o dərgahda xidmət etməkdən məhrum etmisən? Bəlkə, Sənin haqqında səhlənkarlıq etdiyimi görüb, məni uzaqlaşdırdın? Bəlkə, Səndən üz döndərdiyimi gördün və mənə qəzəbləndin? Bəlkə, məni yalançılar sırasında gördün və başlı-başına buraxdın? Bəlkə, Sənin bəxşişlərinə minnətdar olmadığımı gördün və məni nəsibsiz qoydun? Bəlkə, məni alimlərlə həmsöhbət, yaxın görməyib xar etdin? Bəlkə, məni qəflətdə olanlarla görüb, rəhmətindən naümid etdin? Bəlkə, məni batil əməl sahibləri ilə görüb, onlara .(«tapşırdın? («Məfatihul-cinan

Yuxarıda müvəffəqiyyətsizlik amilləri sadalandı və mənə elə gəlir ki, onlar kifayət qədər oyadıcıdır. Ümid edirəm ki, siz bu amillərdən heç birinin tə'siri altına düşməyəcəksiniz. Allaha ümid bağlamaqla, proqramları əvvəlki kimi icra edin. !İrəliləyin, addımlayın! Böyük xoşbəxtliklər və ali dərəcələr sizin intizarınızdadır

.Ağamız Mehdi (ə.c) həzrətlərinin ətəyindən yapışın və onun zühuru üçün dua edin

Allah sizləri və bizi Məhəmməd və ali Məhəmməd ehtiramına dünya və axirətdə .sabitqədəm etsin!Amin

SUAL ۶: Əziz müchətihidimz həzrət Ayətullah-üzma hacı şeyx Lütfüllah Safinin hüzuruna. Salam!Sizi Həzrət Fatimeyi-Zəhranın (ə) viladət günü münasibəti ilə təbrik edirəm. İslam yolunda sabitqədəm olmağım üçün bu mübarək günlərdə bir nəsihət .buyurmanızı xahiş edirəm

.CAVAB: Bismillahir-rəhmanir-rəhim

Əlhəmdulillahi rəbbil aləmin Vəssəlatu vəssəlamu əla səyyidina və nəbiyyina Əbil-.qasimi Muhəmmədin və alihit-tahirin, siyyəma bəqiyyətillahi fil-ərzin

Allah-taala buyurur: «Bilin ki, mənim doğru və düzgün yolum budur. Onu seçin və digər yolla getməyin ki, sizi Onun yolundan uzaqlaşdırar. Sizə belə tapşırılmışdır. Olsun ki, .(amanda qalasınız» (Ən'am-۱۵۳

Sizə verəcəyim nəsihətlər Əllamə Hillinin öz oğlu Fəxrül-Mühəqqiqinə etdiyi nəsihətlərdən götürülmüşdür. O, ən böyük islam alimlərindən, əqli və nəqli elmlərdə misilsiz ustadlardandır. O, çox qiymətli «Təvaid» kitabının sonunda elm aləminin iftixarı .olan oğluna bir sıra tapşırıqlar vermişdir

O, böyük fəqih öz şərəfli oğluna xeyir-dua verdikdən sonra ona təqvalı və pəhrizkar olmağı vəsiyyət edir. Onu Allahın əmrlərinə itaətə, ilahi

.razılığa səbəb olacaq işlərə, nəhy edilən işlərdən uzaqlaşmağa çağırır

O, öz oğlundan istəyir ki, ömrünü fəzilət qazanmağa, nadanlıq və naqislik uçurumundan elm və kamal, saleh əməllərin ən ali dərəcəsinə yüksəlməyə sərf etsin, .vaxtını səmərəsiz keçirməsin

Bu vəsiyyətlərdən biri də mö'min qardaşlara kömək, zəiflərin ehtiyacını ödəmək, pislik qarşısında yaxşılıq, yaxşılıq qarşısında təşəkkürdür. Onu əxlaqsız və qanmaz .adamlarla dostluqdan, hömsöhbət olmaqdan çəkindirir

Digər tərəfdən öz övladına alimlərlə yaxınlığın gözəl əxlaqa səbəb olduğunu anladır. Səbr və təvəkkül, nəfslə hesab aparmaq, bağışlanmaq istəmək, zülmdən çəkinmək vəsiyyət olunur. Yaddan çıxarma ki,Allah zəif və əldən düşmüş şəxsləri incidənin, .yoxsula əziyyət verənin günahından keçmir

Sonra buyurur: Gecə namazını unutma və çalış həmişə onu yerinə yetirəsən. Böyük məqamlı Peyğəmbər (s) mö'minləri ona rəğbətləndirib: «Behişt ömrünün sonunu .(gecələr durmaqla keçirənindir» (Əvaliyul-ləali ٢-ci cild

Qohum-əqrəba və yaxın adamlara baş çək – bu, ömrün uzanmasına səbəb olar. Bacardıqca gözəl

əxlaqa yiyələn. Həzrət Peyğəmbər (s) buyurur: «Doğrusu, heç vaxt malınızla xalqı razı salа bilməzsiniz. Belə isə, onları əxlaqınızla razı salın.» (Həmin mənbə ۴-cü cild).

Pak nəsil olan mə’sum övladlarına, kəramətli seyidlərə bağlı olmağa, onlara xidmət və hörmət göstərməyə çalış. Allah-taala onları tə’kidlə tapşırmış, onlarla dostluğu risalətin savabı bildirmişdir. «Ey Peyğəmbər, de ki, sizdən Əhli-beytlə dostluqdan başqa bir şey istəmirəm» (Şura-۲۳).

Son peyğəmbər həzrət Məhəmməd (s) buyurmuşdur: «Qiyamət günü dörd qrup, dünya əhlinin günahı qədər günah gətirərsə də onlara şəfaət edərəm: mənim nəslimə kömək edənlər, yoxsulluq və çətinlikdə mənim övladlarıma malından bağışlayanlar, dili və qəlbiylə övladlarımı sevənlər, övladlarım qovulub, kənarda qaldıqları vaxt onların ehtiyacını aradan qaldırmaq üçün çalışanlar» (Əvaliul-ləali, ۴-cü cild).

Alimləri əzizlə, fəqihlərə tə’zim et. Həzrət Peyğəmbər (s) buyurub: «Fəqihə ehtiram göstərən şəxs qiyamət günü Allah ilə Onun bəyəndiyi bir halda görüşər. Fəqihi yüngül sayan isə Allah ilə Allahın ona qəzəbləndiyi halda görüşər» (Həmin mənbə, ۱-ci cild).

Alimə və hətta onun evinin qapısına baxmaq, onunla yoldaşlıq edib həmsöhbət olmaq ibadətdir. Sənə dini anlamağı, elm əldə etməyi arzulayıram. Məbada, öz elmini ehtiyacı olanlardan gizlədəsən. Qur'anda buyurulur: «Öz elmini gizlədən şəxsə Allah və bütün lə'nət edənlər lə'nət yağdırar» (Bəqərə-۱۵۹).

Xüsusilə, bid'ətlər zamanı alimlərin öz elmlərini zahir edib, bid'ətləri dəf etməsi və camaatı bu yoldan çəkindirməsi vacibdir. Peyğəmbər (s) buyurur: «Ümmətim arasında bid'ətlər aşkar olduqda din aliminə öz biliyini bəyan etmək vacibdir. Belə olmasa, Allahın lə'nəti olsun ona» (Əvaliul-ləali, ۴-cü cild).

Əllamə Hillinin (r.ə) buyuruqlarından əlavə, mənimdə tövsiyəm budur ki, Allahı unutma və Ona elə ibadət et ki, sanki Onu görürsən. Sən Onu görmürsənsədə, O səni görür. Onu ürəyinlə, dilinlə daim xatırla. Yə'qin ki, O da səni yada salar. (Bəqərə-۱۵۲).

Onun ne'mətlərinə şükrü unutma. Ne'məti danmaqdan, Onun ne'mətləri ilə Ona günah etməkdən çəkin. «Şükr etsəniz, ne'mətləri artıraram və əgər küfr etsəniz, [bilin ki] mənim əzabım ağırdır» (İbrahim-۷).

səh:۱۹

Alış-verişdə insafı gözlə. Kimsənin kiçik olsa belə, haqqını inkar etmə. Bacardığın qədər din qardaşlarına kömək göstər. Üç əməl çox faydalıdır: dostlara maddi kömək, camaatla insaflı rəftar, Allahı hər zaman xatırlamaq. (İrşad, ۲-ci cild).

Mö'min qardaş və bacıların hüququna riayət et. Bunun üçün ən asan yol özün üçün istədiyini onlar üçün də istəmək, özün üçün xoşlamadığını onlar üçün də xoşlamamaqdır. Səninlə əlaqəni kəsənlərə yaxınlaş, sənə zülm edənləri bağışla.

Lovğalıq, qürur, xudbinlik, başqalarına yuxarıdan baxmaqdan çəkin. «Lovğalıq edənlərin yeri cəhənnəm deyildirmi?» (Zumər-۶۰).

Allah bəndələrinə mö'min bacı və qardaşlarına saymazyana baxma. Sənin alçaq gördüyün şəxs Allah övliyalarından ola bilər. Zahiri əlamətlər həqiqi ölçü deyil. «Bu dünyada var-dövlət yığanların əli o dünyada boşdur» (Kənzul-ummal).

Başqaları ilə müqayisədə özünü nə qədər kiçik saysan və təvazökarlıq göstərsən, uca məqamlara çatarsan.

Yaxşıya də'vət və pisdən çəkindirməni, İslam kəlməsinin ucaldılmasını, Əhli-beyt məktəbinin təbliğini istiqamət seç. Allah yolunda dostluq və düşmənçiliyi gözlə.

Dünya və axirət izzətinin, cəmiyyətin e’tibarının mühüm səbəblərindən olan əhdə vəfadarlıq, düzlük və sədaqəti uca tut. Hədisdə buyurlur: «İnsanın oruc və namazının .(çoxluğuna deyil, əmanətdarlığına, danışıqda düzgünlüyünə baxın» (Kafi, ٢-ci cild

Həzrət Peyğəmbər (s) bir hədisdə buyurur: «Mənim ümmətim nə qədər ki, əmanəti «.qənimət və sədəqəni ziyan bilmir, həmişə xeyirdədir

:Allahın düşmənləri ilə dostluqdan çəkin və bu üç ayəni unutma

Elə bir qövm tapmazsan ki, Allah və Onun peyğəmbərinə iman gətirsin, amma onların» müxalifləri ilə dostluq etsin – bu müxaliflər onların ataları, övladları, qardaşları və ya .(qəbilələri olmuş olsa da! (Mücadilə-٢٢

De ki, əgər atalarınız, övladlarınız, qardaşlarınız, arvadlarınız, qohumlarınız,» qazandığınız mallar, kasadlığından qorxduğunuz ticarət və bəyəndiyiniz evlər sizin üçün Allahdan, Onun rəsulundan, Onun yolunda cihaddan daha əzizdirsə, Allahın .(əmrini gözləyin, Allah fisq əhlini sevməz» (Tövbə-٢٤

Bu axirət evini dünyada üstünlük arzusunda və azğın olmayanlar üçün qurmuşuq və» .(yaxşı aqibət təqva sahiblərinindir» (Qəsəs-٨٣

Qur'an oxumağı tərk etmə. Rəvayətlərə görə Qur'an Allahın əhdidir. Hər bir şəxs bu .əhdə baxmalı və hər gün ən azı beş ayə oxumalıdır

Yerin və göyün yaranışını, ilahi nişanələri düşünmək, Allahı tanımağa, ruhun və əqlin inkişafına səbəbdir və bu düşüncələrin fəzilətini əldən buraxma! Allah-taala Qur'anda ağıl sahiblərini vəsf edərək buyurur: «Yer üzündə yəqin əhli üçün ibrətlər vardır. Öz .(vücudunuzda görmürsünüzmü?» (Zariyat ٢٠, ٢١

Aləmin zahirinə baş qatıb, onun batinini görməyənlərdən olma. Belələri haqqında buyurulur: «Göylərdə və yerlərdə çox nişanələr vardır ki, onlardan ötüşüb baxmazlar» .((Yusif-١٠٥

Mə'sumlara təvəssüldən, onların müsibət və fəzilətləri zikr olunan məclislərdən, rövzə məclisləri, həzrət Seyyidüş-şühədanın (ə) əzadarlıq məclislərindən uzaq olub, səhlənkarlıq etməyəsən. Ruhun kamilləşməsindən, nəfsin paklaşmasından, çoxlu savab qazanmaqdan, mə'rifət və bəsirətin artmasından ibarət olan bu məclisləri !qənimət say

Xüsusi ilə, həqiqi ne'mətlərin vəlisi, zahiri və batini feyzlər müqəddəs vücudundan bərəkət tapan həzrət Mehdini (ə.c) unutma. Öz rəftar və

danışığınla o həzrəti bacardıqca razı sal. Onun zühurunun tə'cili, nicat dövrünün !yaxınlaşması üçün dua et. Onun həqiqi intizarını çəkənlərdən olmağa çalış

Məhəmməd və ali Məhəmmədə salavat göndərməklə mətin ol! Və bu təqsirli fəqirə də !dua etməyi unutma

**SUAL ٧**

SUAL ٧: Həzrət Ayətullah hacı şeyx Lütfüllah Safinin mübarək hüzuruna. Salam. Xahiş :edirəm ki, suallarıma cavab verəsiniz

?Əgər bir gün Allahd-taala sizin bir arzunuzu yerinə yetirərsə, Ondan nə istəyərsiniz.١

?İnşəallah, qiyamət aləmində Allah şəfaət məqamı verərsə, mənə şəfaət edərsinizmi.٢

.CAVAB ٧-١: Bismillahir-rəhmanir-rəhim

.Sizin iki sual və nəsihət istəməyinizdən ibarət məktubunuz çatdı

Suallar, istəklər, gözəl niyyət, dini baxış və vicdanlı həyatın təzahürüdür. Mən bu qəlbinizə, imanınıza görə sizə təbrik deyir, Allahdan sizin üçün müvəffəqiyyət və kamil .iman istəyirəm

Vaxt darlığı səbəbindən müxtəsər cavab verməyə çalışsam da, mövzuların mə'nəviliyi və onların insan ruhuna bəxş etdiyi şirinlik söhbəti uzadır. Əgər qələmin cilovu çəkilməsə, nəfs bu ürəyəyatan mövzulardan doymaz, qələm yazmaqdan

yorulmaz. «Həmd olsun o Allaha ki, bizi hidayət etdi və Allah yol göstərməsəydi, heç .(vaxt haq yolu tapa bilməzdik» (Ə'raf-۴۳

Dünyanın vəziyyəti və dünya xalqlarının fərqli xarakteri, eləcə də, dünyada gedən dəyişikliklərin hər biri moizə və nəsihətdir. Zatın hər bir zərrəsi, hər bir yarpmaq, yağış damlası, hüceyrə, canlı, cansız, bitki, insan, dağ, dəniz, ulduz, qalaktika həqiqətlərdən bir aləm, mə'nalardan bir kitab, Allaha tərəf gedən bir yoldur. İlahi qayda olan geyimlər, həyat və ölüm, zahiri görünüşlərin və ne'mətlərin təzələnməsi, ömürlərin sona çatması, dövlətlərin süqutu düşüncəli insanlar üçün həmişə ən yaxşı moizə olub və olmaqdadır. «Səbəb Allahın haqq və Ondan qeyri çağırılanların batil olmasıdır. .(Allahın mərtəbəsi yüksək və böyükdür» (Loğman-۳۰; Həcc-۶۲

Yaranış kitabının hansı nöqtə, hərf və kəlməsində, hansı hadisə, kiçik və ya böyük varlıqda ilahi nişanələr müşahidə edilmir ki, qafil insanlar qəflət yuxusundan oyanıb, işlərin aqibəti haqqında düşüncəyə vadar olmasın, yeganə Yaradanın əzəməti !?qarşısında səcdəyə getməsin, dilindən tövhid kəlmələri qopmasın

İlahi, həqiqətən səmadakı və yerdəki hərəkətlər, gözlərdəki baxış, dənizlərin hər bir» qətrəsi, ağacların hər bir

.«yarpağı Sənə dəlil və şahiddir, Sənin mülkündə heyrandır

.Bəli, bütün müşahidə olunanlar ilahi varlığın, Onun elm və qüdrətinin nişanələridir

Ayıqlar nəzərində yaşıl-yaşıl yarpaqlar

.İlahi bir düzümdən söz danışan varaqlar

Varlığın atomdan tutmuş kəhkəşanlara qədər bütün hissələri Allahın qüdrəti sayəsində hərəkətdədir. Bu təbii hərəkət insan vücudunun zərrələrində də cərəyan etməkdədir. Bütün zərrələr batini bir dillə xəbərdarlıq edir ki, ixtiyar və iradə meydanında hərəkət karvanından geri qalmaq olmaz. Təəssüf doğurar ki, insan bütün bu moizə və .xəbərdarlıqları qulaq ardına vurub, ömrünü qəflətdə və oyun-oyuncaqla keçirsin

Hədisdə belə buyurulur: «İki günü bərabər olan şəxs ziyankar və bu günü dünənindən .(pis olan şəxs məl'undur» (Məanul-əxbar

Bütün gördükləriniz bizi ayıq olub, vaxtın qədrini bilməyə çağırır. Cavanlığın arxasında qocalıq, sağlamlağın arxasında xəstəlik və həyatın arxasında ölüm dayanmışdır. Vaxt varkən ayağa qalxın, qarşıdakı uzun yolunuz üçün azuqə hazırlayın. Əli (ə)-ın buyuruğunu unutmayın: «Bu

qədər öyüd-nəsihət aqil insanların moizəsi və nadanların ibrət götürməsi üçün .(kifayətdir.» (Nəhcül-bəlağə

Birinci sualınız olduqca əhəmiyyətlidir. Elmin dərinliklərinə getmiş, kamillik və bəsirət mə'dəni olan, Allahdan ilhamlanan İmamlardan (ə) savay kimsə bu suala qənaətbəxş cavab verə bilməz. Arzularımdan birinin yerinə yetiriləcəyi təqdirdə Allahdan nə istəyəcəyimi bilmirəm. Onun dərgahından sabit iman, razılıq, yoxsa cənnətmi istəyim? Yoxsa həzrət Mehdinin (ə.c) zühurunu istəyim? Bəlkə, deyim ki, ilahi məni öz ?bəyəndiyin kimi et? Ya da bütün bəndələr üçün dünya və axirət səadəti diləyim

Ancaq mən Allahı bağışlayan və bəxşiş verən kimi tanıyıram. Onun rəhmət və kəramət xəzinələrindən nə qədər bağışlanarsa, zərrəcə azalmaz. Bütün dualar icabət olunar. O, mütləq feyz bağışlayandır. «Onun birini dinləməsi digərini dinləməsinə mane olmur və istəyənə də, istəməyənə də əta edir» (Kafi, ٢-ci cild). Onun xəzinələri tükənməz və çox .(bağışlamağı ona yalnız kərəm və səxavət artırar» (Məfatihul-cinan

O, öz kitabında və həzrət Rəsula (s) vəhyində dua üçün hamıya mütləq izn verib. «Sizin .Allahınız deyər: çağırın Məni, cavab verim sizə

Şübhəsiz, Mənə ibadət etməyi özlərinə sığışdırmayanlar tezliklə xar və zarıyan halda cəhənnəmə daxil olacaqlar» (Ğafir-۶۰). Beləliklə də, hamıya dua əmri verilmiş, qurtuluş .qapıları taybatay açılmışdır

Bu səbəbdən də mən bütün ehtiyaclarımı Ondan istəyirəm və Onun ətasını məhdud saymıram. Fəxr edirəm ki, vücudum başdan-ayağa Ona möhtacdır və izzətim Onun .ətasına bağlıdır

Onu da qeyd edim ki, həzrət Peyğəmbər (s) və Əhli-beytdən rəvayət olunan dualar arasında bütün məqsəd və mətləbləri özündə cəmləşdirən dualar çoxdur. Lakin bu .dualar artıq seçilmiş olduğu üçün onların arasından bir neçəsini seçmək olmaz

Əgər imamların səhabələrinin, alim və hədisçilərin tərtib etdikləri mö'təbər .kitablardan hər birimiz faydalansaq, saysız-hesabsız rəhmət xəzinələrinə yol açılar

Bu dualar bəşərin həqiqi ehtiyaclarının bəyanından əlavə, oxuyanın diqqətini ehtiyacsız Allaha yönəldir, onda füsünkar mə'nəvi halətlər yaradır, Allahla ünsiyyətdən zövq alınır. Eləcə də, elm, mə'rifət, əxlaq, fəzilət qapıları dua oxuyanın .üzünə açılır

Yəqin ki, o həzrətlərin dua göstərişləri olmasaydı, bəşəriyyət dua işığında vücuda gələn kamilliyi dada bilməzdi. Bu dualar Allahı hansı adlarla çağırmağı, nə istəməyi .öyrədir

Bu dualar və xüsusi ilə də Qur’andakı dualar nur, iman, Allaha tərəf seyr, heyvani və nəfs ani istəklərindən qurtuluş, mələkuti dərəcələrə yüksəliş, rəhmət dəryasında üzmək və həqiqi bərəkətdir. İmam Zeynəlabidin (ə) münacatlarından birində belə buyurur: «Ey o kəs ki, səltənəti bütün yeri tutmuş, cəlal və əzəməti hər şeyə qalibdir. Məhəmməd və onun ailəsinə salam göndər. Qəlbimi Sənə tərəf yönəlməyin şadlığı ilə «.doldur və məni Sənə itaət edənlər cərgəsinə qoş

Duanı oxuyarkən anlayırıq ki, Allahdan bir şey istədiyimiz zaman bu sözləri tapa bilməzdik. Öz hacətlərimizi bu duadakı məqamlarla dərk etməz, dünyəvi və maddi istəklərlə kifayətlənərdik. Uyğun duada yenə də buyurulur: «Ey o kəs ki, yolunu azmışlar ona üz tutar, Onu rəhbər görərlər. Qorxmuşlar Onu səslər, Onu sığınacaq bilərlər. İbadət edənlər Ona pənah aparar, Ona arxalanarlar. Axı nə vaxt Səndən qeyrisini çağıran sevindi, Səndən qeyrisi üçün əziyyət çəkən rahatlıq tapdı? Mənim Allahım, sübhlərin

işığı, gecənin qaranlığını apardı. Mənsə hələ də arzuma çatmamışam və münacat bulağından doymamışam. Məhəmməd və onun ailəsinə salam göndər. İstəklərimin qəbulu və ya binəsib qalmağım, hansı məsləhətdirsə onu yerinə yetir. Ey .(mehribanların mehribanı.» (Səhifeyi-səccadiyyə

Mə'sumlardan bizə yetişmiş bütün digər dualar da kamil mə'rifət, bəsirət, tərbiyə aşılayan məzmuna malikdir. Onların vasitəsilə qəlb saflanır, insanın mə'nəvi aləmin .seyrinə şövqü artır

Kamil dualardan bə'zisi Allahdan müvəffəqiyyət, sağlamlıq, yəqin məqamı, təvəkkül və riza diləyir. «Məkarimul-əxlaq» duası kimi dualarda həqiqi ehtiyac və pak fitrət istənilir. Dua edən öz məqam və fəzilətindən asılı olmayaraq, özünü yoxsul, tam ehtiyac içində görür və zatən varlı, kamil olan Allah qarşısında özünü bacardıqca kiçik .fərz edir. İnsan bu dualarla ən qorxulu hadisələrlə üzləşmək üçün silahlanır

Dua əhlini bəla tufanları acizləşdirmir, çətinliklər əldən salmır. Mə'yusluq və ümidsizlik onlara qələbə çalmır. Ümid Allaha və Onun qüvvəsinədir. «Ey Allah, Səndən ürəyimə, canıma qarışmış iman, yəqin istəyirəm ki, mənə yazdığından başqa bir şey .çatmayacağını bilim

.(Məni qismət etdiyin şeylərdən razı sal.» (Səhifeyi-səccadiyyə, ۲-ci cild

Bu kimi dualarla insanlar çətinliklərə qalib gəlib, öz iman və mövqelərində möhkəmlənirlər. «Allah bizə kifayətdir», «Öz işimi Allaha tapşırıram», «Biz Allah tərəfindənik və Allaha tərəf qayıdacağıq», «Allahdan başqa heç bir qüvvə və qüdrət yoxdur» kimi ayələr bütün zəif nöqtələri qüdrətə çevirir. Həzrət Peyğəmbərin (s) öz qızı Fatiməyə (ə) öyrətdiyi duadakı kimi: «Ey diri və əbədi! Öz rəhmətinlə köməyimə çat, məni bir an da özbaşına buraxma və bütün işlərimi islah et.» (Kənzül-ümman). Dua edən şəxs özünü Allahın amanında və himayəsində görür, heç bir kasıbçılıq və zərər .onu qorxutmur

Həqiqətən dua və çağırışın özü istənilən hacətlərdən daha mühüm və feyzlidir. Ona .görə də istər kiçik, istərsə də böyük hər nə varsa, Allahdan istəmək lazımdır

Xoş o dostların halına ki, Allahla dua vasitəsilə daim rabitədədirlər və vay olsun duanın ləzzətindən və bərəkətindən məhrum olanların halına. Allaha ibadət və pərəstişin həqiqəti duadır. (bax: Bəqərə-۱۵۶). Hədisdə «dua ibadətin məğzidir» buyurulur. .((Vəsailüş-şiə, ۴-cü cild

Rəvayətdə nəql olunur ki, imam Sadiqdən (ə) soruşdular: İki şəxs namaza birlikdə başlayıb, birlikdə də bitirdilər. Namaz zamanı onlardan birinin duası, digərinin qiraəti ?mükəmməl idi. Hansının fəziləti daha çoxdur

İmam (ə) birinci dəfə «hər ikisi fəzilətlidir» deyə cavab versə də, sual verən şəxs yenə «.də cavab istədi. Həzrət (ə) buyurdu: «Duası çox olan daha fəzilətlidir

Uca Allahdan istəyirəm ki, qəlbimizi duaya şövq nuru ilə işıqlandırsın, hər zaman duanın bərəkətindən feyz alaq. Xüsusi ilə həzrət Bəqiyyətullah İmam Zaman (ə.c) üçün .duaya müvəffəq olub, onun hakimiyyət ne'mətinin qədrini bilək

Cavab ٧-٢: Qiyamət günü məndən şəfaət istəyirsiniz. Əvvəla, ümid edirəm ki, siz özünüz şəriət təkliflərinə əməl etməklə, pak iman və Əhli-beytə bağlılıq ruhiyyənizlə şəfaət edənlərdən (bağışlatdıranlardan) olacaqsınız. Rəvayətə görə, mö'minlər də .şəfaət edənlərdəndir

İkincisi, hamınızın gözü həzrət Rəsuli-əkrəm (s) və Əhli-beytin (ə) şəfaətindədir. Qiyamət günündə şəfatə edənlər çoxdur – o cümlədən dinin həqiqi keşikçisi olan alimlər. Lakin şiələri və mö'minləri

qurtuluş mənzilinə, ali dərəcələrə çatdıran xüsusi şəfaət Məhəmməd və ali .Məhəmməd (s) şəfaətidir

,Tubanın təşnəsin yatırdı Kovsər

?Bahar yağışından olarmı əsər

Öz Allahı ilə əhd bağlamış sizin kimi insanların mənim kimi qüsurlu bir bəndənin şəfaətinə nə ehtiyacı var? Əgər şəfaətdən bir pay nəsib olsa, o da Məhəmməd və ali .Məhəmməd (s) şəfaətinin sayəsindədir

Şərafətli hədislərə görə şəxslərdən şəfaətə şamil olmaq maneələri yoxdursa, ali dərəcə sahibi olanlar aşağı mərtəbəlilərə şəfaət edirlər. Bu şəfaət yalnız günahkarlara deyil, saleh adamlara da aiddir və onların dərəcəsini yüksəldir. Buna əsasən də həzrət Peyğəmbər (s) günahkarlara, salehlərə, şəhidlərə, hətta peyğəmbər və imamlara da şəfaət edə bilər. Əgər şəfaət günahkarları bağışlatdırarsa, digərlərinin mərtəbələrini daha da ucaldar. Bu mə'nada mə'sumların şəfaəti bütün şəxsiyyətlərə və məqam sahiblərinə şamil olunur. Günahkarlara şəfaətin əhatəsi o qədər genişdir ki, onların adlarının Məhəmməd, Əli, Fatimə, Həsən, Hüseyn və s. olmasının da əhəmiyyəti vardır. Bütün bunlara baxmayaraq insan bədbəxtçilik

biyabanında, cəhənnəm əzabında süquta uğrayır. Əgər az mə'rifətli birisi «təəccüb edirəm nicat tapana, axı necə nicat tapıb» demişsə, kamil söz imana məxsusdur: «təəccüb edirəm həlak olana, axı necə həlak olub?». Doğrudan da insan səadətə .çatmalı, xoşbəxt olmalıdır və bu bir gerçəklikdir

İnsan bu ilahi feyzləri əldə etmək yolunu tutmalı, haqqın rəhmət günəşinin nurundan məhrum olmamalı, günahın insanı yuvarlatdığı çıxılmaz zülmətdən qorxmalı, qəfil əzabdan həzər etməli, bu ayəni unutmamalıdır: «Sonradan pis iş görənlərin aqibəti daha da pis oldu. Çünki onlar Allahın ayələrini yalan bilib, məsxərəyə qoydular.» (Rum-.(١٠

İnsan özünü fəlakətə atmamalı, ilahi rəhmətdən nə məğrur, nə də mə'yus olmamalıdır. Ümid və qorxu arasında ayıq halda irəliləyib, şeytanın və alçaq nəfsin şərindən Allaha sığınmalıdır. «Uca və əzəmətli Allahın qüvvəsindən qeyri bir qüvvə «.yoxdur. İddiamızın sonu budur ki, həmd və səna aləmlərin Rəbbinə məxsusdur

### SUAL ٨

SUAL ٨: Cənab Ayətullah-üzma Safinin hüzuruna. Salam! İbadətlərinizin haqq dərgahında qəbul olması arzusu ilə! Öz hikmətli öyüdlərinizlə yetkinlik yaşına çatmış .cavanlara yol göstərməyinizi xahiş edirəm

.CAVAB: Bismillahir-rəhmanir-rəhim

Qur’anın müraciət etdiyi, ilahi vəzifələr şərəfinə çatmış əziz yeniyetmələr və övladlar! .Bu yaşa, bu ləyaqətə çatmağınız münasibəti ilə sizi təbrik edirəm

Diqqətli olun, bu tarixdən başlayaraq islami cəmiyyətdə üzvlüyə qəbul olmusunuz. Əxlaqınız, danışığınız, fəaliyyətiniz üzərində hesab aparırlar. Allah-taala sizə e’tibar əta etmiş, (Qur’anda ۸۸ dəfə) «Ey iman gətirənlər» deyə sizə üz tutmuşdur. Həmin bu .e’tibar baxımından da cəmiyyətdə qiymətiniz vardır

Sizin fəaliyyətiniz və sözünüz bu vaxtadək şəriət nöqteyi-nəzərindən e’tibarsız idi. Sizin haqqınızda başqaları qərar çıxarırdılar. İndi isə öz ixtiyarınızdasınız. Allah, .Peyğəmbər, mə’sumlardan başqa kimsəyə tabe deyilsiniz

Tövhid, nübüvvət, imamət, mə’ad, keçmiş peyğəmbərlər, kitablar və mələklərə olan e’tiqadınızı qısaca da olsa, dəlillərlə möhkəmləndirin. Çalışın ki, Allahın yardımı ilə Ona bəndə, Peyğəmbərə itaətçi, imamlar və xüsusilə də həzrət Mehdi (ə.c) üçün həqiqi əsgər, xalis şiə, İslam və Qur’an üçün əmin keşikçi, mö’minlər üçün qayğıkeş bir qardaş olun. Hamının, xüsusilə də ata-ana, müəllim və

alimlərin haqqına riayət edin. Sözün qısası, özünüzü gözəl islam əxlaqı ilə zinətləndirin, xalqa yaxşılıqda, elm və mə’rifət təhsilində daim yorulmadan çalışın. İnkişafınız üçün .bütün imkanlardan səmərəli istifadə edin

Bu gündən başlayaraq həyatınızın dəqiqələrinin də qədrini bilin. Axı siz islam ümməti üçün iftixar olmalı, izzət sahibinə çevrilməlisiniz. Vaxtınızı tənbəllik və süstlüklə keçirməyin, Allah eləməmiş, pislənmiş və haram işlərə, oyunlara sərf etməyin. Bir .zaman elə olsun ki, ötən günlərinizə nəzər salanda şad və xoşbəxt olasınız

Əzizlərim! Təklif nədir? Təklif yaşına çatmaq nədir? Yə’ni, bu söz, bu da meydan! Bu siz, bu da səadətli fürsətlər! Yə’ni, məs’uliyyət, özünütərbiyə, quruculuq dövrünə qədəm qoyma, ilahi imtahanlarla üz-üzə! özünüzü belə bir həyat üçün hazırlayın və heç bir qiymətə Allahdan başqasına satmayın. Əslində, sizin qiymətiniz behiştdir. .(«Özünüzü behiştdən qeyri bir şeyə satmayın.» (Nəhcül-bəlağə

Çalışın ki, seçdiyiniz fəaliyyət sahəsində cəmiyyət üçün faydalı və e’tibarlı bir üzv olasınız. Fərz edin ki, hamı sizin çalışqanlığınıza möhtacdır və siz öz payınıza düşən bu .ehtiyacları aradan qaldırmalısınız

Allahı heç zaman unatmayın. Onu xatırlamaqdan, dua və ibadətdən, imamlara təvəssüldən, şərəfli hərəmlərin ziyarətindən güc alın. Allahın lütfünə və yardımına ümidvar olun. Qur'anda buyurulur: «Haqqımızda çalışanları xüsusi yollarımıza hidayət edərik və şəksiz ki, Allah yaxşı iş görənlərlədir.» (Ənkəbut-۶۹).

**SUAL ۹**

SUAL ۹: Ayətullah-üzma Safi Gülpayiqani ağanın müqəddəs hüzuruna. Salam!

Mən gəncliyimin əvvəl dövründən başlayaraq əmmarə (alçaq) nəfs ilə mübarizədə olmuşam. Amma bə'zən müvəffəqiyyət qazana bilmirəm, əmmarə nəfs məni pis işlərə sövq edir. Günaha batandan sonra vicdan əzabı çəkirəm. Mənə ümid verib, kömək göstərməyinizi xahiş edirəm.

CAVAB: Bismillahir-rəhmanir-rəhim.

Həzrət Peyğəmbər (s) belə buyurmuşdur: «Ümmətimin ən yaxşısı gəncliyini Allaha itaətdə keçirən, nəfsini dünya ləzzətlərindən qoruyan və onu (nəfsini) axirət yolunda zəhmətə salan şəxsdir. Həqiqətən, belə bir şəxsin mükafatı Allah yanında behişt dərəcələrinin ən ucasıdır.»

Əziz övladım! Çoxları ondan-bundan şikayətlənirsə, siz özünüzdən narazılıq bildirirsiniz. Mə'lum olur ki, əmmarə nəfs ilə çarpışmadasınız. Başqa sözlə, həzrət Peyğəmbərin

s) buyurduğu kimi, nəfs ilə cihaddasınız. Düşməni güclü görür və Allah eləməmiş,) məğlubiyyətdən qorxursunuz. Sizi əmin edirəm ki, düşmən qarşısında müqavimət göstərib, meydanı daraltsanız və onun istəklərinə əvvəlcədən baş əyməsəniz, nəhayətdə qalib gələcəksiniz. Bilin ki, onun istəkləri saysız-hesabsızdır. Əvvəlcədən onun bir istəyinə baş əysəniz, növbəti əmrlərinə verəcək və şəxsiyyətinizi tam məhv etməyincə qane olmayacaq. Əsil döyüş və cihad meydanı həmin bu cavanlıqdır. Sözsüz ki, əmmarə nəfs hər insanı məğlub edə bilmir. Həqiqi cəngavərlər bu .meydanda özünü göstərib mükafatlar ala bilər

Siz və sizin həmyaşıdlarınızın hər biri bu böyük imtahandan keçməlidir. Allahı xatırlayın və Ondan və'də etdiyi yardımı istəyin. (Ənkəbut-۶۹). Allah cihad edib, Ondan yardım .istəyənləri hidayət edər. O, yaxşı iş görənlərlədir

Sizdəki bu çarpışma ruhiyyəsi agahlıq və bəsirət mərhələlərindəndir. Ümid var ki, bu .agahlıq hesabına, əksər cavanların qərq olduğu girdabdan qurtulasınız

İlk baxışdan çətin görünən bu müqavimət nəfsə itaət etmədən irəlilədikcə asanlaşır. Təcrübəli və mö'min şəxslərlə ünsiyyətdə olmağa çalışın, dini söhbətlərdə iştirak edin. ,««Me'racüs-səadət

səh:۳۷

Həyatül-qülub», «Eynul-həyat», kimi kitabları mütaliə edin, «Kumeyl» və «Nüdbə» duaları » .oxumaqla, imam Zamana (ə.c) təvəssül etməklə özünüzü cihada hazırlayın

.Aydın gələcəyinizə ümidlə, sizin və həmyaşıdlarınızın tofiq tapması üçün dua edirəm

**SUAL ۱۰**

SUAL ۱۰: Xahiş edirəm ki, yeni dərs ilinin başlanğıcında tələbə və şagirdlərə öz .göstərişlərinizlə yol göstərəsiniz

.CAVAB: Bismillahir-rəhmanir-rəhim

Həzrət Peyğəmbər (s) buyurmuşdur: «Bilin ki, Allah elm tələb edənləri sevir» (Kafi ۱-ci .(cild

Əziz tələbələr və şagirdlər, islam övladları! Allahın salam, rəhmət və bərəkəti sizə şamil olsun ki, yeni təhsil ilini həvəslə qarşılayıb, institut və məktəblərin qapısını tərəqqi .və kamillik qapısı hesab edirsiniz

.(Hədisdə buyurulur: «Özünüzü ilahi əxlaqlarla zinətləndirin» (Bəharul-ənvar, ۶۱-ci cild

İlahi sifətlər arasında ən şərəflisi elm sifəti, sifət isimləri arasında ən əzəmətlisi alim .sifətidir. Ona görə də elm sifəti ilə zinətlənmək digərlərindən daha üstün və dəyərlidir

Allahdan bir nişanə tapıb, ona yiyələnmək həmin ilahi əxlaqa sahib olmaqdır. Bu nişanələrin ən mühümü elm və qüdrət, bilik və bacarıqdır. Bu iki

sifət əlaqəlidir və onların ayrılması qeyri-mümkündür. Harada bilik varsa, orada bacarıq var və harada bacarıq varsa, orada bilik var. Beləcə, bəşəriyyətin ehtiyacları arasında elmdən üstünü yoxdur. Onu tələb edənlər daim axtarışdadır. Həzrət Əli (ə) buyurub: «Bilik qabından savay bütün qablar dolduqca daralır. O isə dolduqca .(genişlənir.» (Nəhcül-bəlağə

Əzizlərim, bu fürsəti qənimət bilin. Oxuyun ki, agahlıq və mə’rifətə çatasınız. Oxuyun ki, özünüzü, cəmiyyəti, islamı izzətləndirə biləsiniz. Oxuyun ki, özünüzü və başqalarını cəhalət pəncəsindən qurtarasınız. Müxtəlif elm sahələrində bu günədək açılmamış düyünləri açmaq üçün oxuyun. Oxuyun və alim olun. Siz kimsədən əskik və bacarıqsız .deyilsiniz

Dünya və onun gələcəyi bilikli millətlər üçündür. öz elminizlə islam ümmətinin tarixi .şərəf və izzətini özünə qaytarın. İradəli olun, heç bir elmi dərəcəni əlçatmaz saymayın

Allah-taala bəşəriyyətə kainatı ram etmək ləyaqəti vermişdir. Elmə varmaqla kainatın sirlərini açın. Fitrətən tələb olunan bütün faydalar elm vasitəsi ilə əldə edilir. Zülmət və .zillət isə cəhalət nəticəsidir

Özünüzü Allah və İslam kəlmələrini ucaltmaq, Qur’an hədəflərinin gerçəkləşməsi, məhrumlara xidmət üçün hazırlayın. Elm yolunda üzərinizə düşən əziyyətləri Allah bəndələrinin rahatlığı üçün vəzifə bilin. Hamı sizin intizarınızdadır. Allah sizdən çalışqanlıq və fədakarlıq gözləyir. İslam və islam peyğəmbəri sizin ibtidai və ali təhsilinizin, elmi tədqiqatlarınızın intizarındadır. Mə’sumlar, xüsusilə də əsrin imamı .həzrət Bəqiyyətullah (ə.c) sizi gözləyir

Hamının gözü elmi mərkəzlərə, dərs və tə’lim otaqlarına dikilməlidir. Sizin necə çalışdığınız, özünüzü necə hazırladığınız diqqət mərkəzindədir. Elm ocaqlarında .müəllimlər, tərbiyəçilər və müdiriyyət bu amallar yolunda əl-ələ verməlidirlər

Agahlıq, düşüncə və bilikdən ləzzət almağa çalışın. Öz vaxtınızı faydasız işlərə, müsabiqə və oyunlara sərf etməyin. Həqiqi kamillik və ilahi seyr arxasınca gedin. «Yoxsa güman edirsiniz ki, sizi səbəbsiz yaratmışıq» (Mu’minun-۱۱۵), «Bu dünya puç və faydasızlıqdan başqa bir şey deyil» (Ənkəbut-۶۴). Bu ayələrin dəyərli mə’nasını unutmayın. Vaxtı bada verən oyunlardan çəkinin. Bə’zilərində müəyyən fayda olan .belə oyunlar təhsildə geriliyə səbəb olur

Həqiqi kamilliyə çatmaq istəyirsinizsə, ətrafınızdakılar da əyləncələrdən uzaqlaşıb .sizinlə həmkarlıq etməlidir

Qısası, onsuz da əldən gedəcək ömrünüzü ucuz qiymətə satmayın. Bilin ki, elm və mə'rifətdən, ilahi razılıq və ilahi seyrdən qiymətli bir şey yoxdur. Həzrət Əli (ə) buyurur: «Elə bir azadə insan yoxdurmu ki, ağzındakı yemək qırıntısı tək dəyərsiz olan dünyanı öz əhlinin öhdəsinə buraxsın? Doğrusu ömrünüzün qiyməti yalnız behiştdir. Dünyanızı .(behiştdən başqa bir şeyə satmayın.» (Nəhcül-bəlağə

Özünüzü vəzifəli bilin, ləyaqətsiz və haram işlərdən çəkinin. Vacib əməllərə, xüsusi ilə də mö'min me'racı olan namaza əhəmiyyət verin. Cümə və camaat namazında iştirak edin. Tələbəlik və şagirdlik vüqarınızı qoruyun. Öyrənmək və öyrətməyi Allahın razılığı, .ilahi sifətlə zinətlənmək üçün hidayətçi bilin. Allahdan yardım diləyin

Cəmiyyətin mövlası həzrət Mehdini (ə.c) Allahla öz aranızda vasitə qərar verin və bilin ki, sizin müvəffəqiyyətləriniz o həzrəti sevindirir. Siz hamınız o həzrətin ruhani .övladlarısınız və o hər bir atadan daha çox sizin müvəffəqiyyətinizi arzulayır

Hər biriniz üçün, islamın əzəməti üçün, elmi mərkəz və institut məs’ullarının .müvəffəqiyyəti üçün dua edirəm

### SUAL ۱۱

!SUAL ۱۱: Həzrət Ayətullah-üzma Safinin hüzuruna salam

Məntəqəmizdə xüsusi ilə qadınlar arasında intihar (özünü öldürmə) halı çoxalıb. Bu hal .və onun aqibəti haqqında mübarək nəzərinizi buyurun

.CAVAB: Bismillahir-rəhmanir-rəhim

Özünə qəsd etmək böyük günahlardandır. Bu günaha görə istər kişi, istərsə də qadın Allahın şiddətli əzabına düçar olar. Əgər insan dəli və əsəbi deyilsə, günahın səbəbi .axirət inancının zəifliyi, dözümsüzlük və Allahdan ümidsizlikdir

Bu günaha batanların çoxu bir sıra vahimə və xəyalların tə’siri altında olur. Məsələn, qızışdırıcı oyunlar və ya saysız evlənmələrdəki müvəffəqiyyətsizliklər, məişət sıxıntıları .qarşısında məğlubiyyət intihara səbəb olur

Bu qəbil insanlara dünya və dəyişikliklərin daim hərəkətdə olduğunu anlatmaq lazımdır. Həyatda adətən, səbirsiz, müqavimət ruhiyyəsi olmayanlar məğlubiyyətə uğrayırlar. Onlarda gələcəyə ümidsizlik yaranır, problemləri həllolunmaz hesab edirlər. Hansı ki, dözümlü şəxslər Allaha təvəkkül

səh:۴۲

.etməklə çətinliklərə səbr edir və gələcəyə ümid içində, problemlərlə çarpışırlar

Bəşər tarixi çətinlik ardınca rahatlıq, yoxsulluq ardınca rifah səhifələri ilə zəngindir. Müvəffəq insanların ruhiyyəsini heç bir hadisə sındıra bilmir. Allahın lütfünə güvənənlər «həqiqətən, hər bir çətinlik ardınca rahatlıq var» (İnşirah-۵) ayəsini .unutmurlar. Zaman keçir və zülmətlər nura boyanır

Belələrini səbrə də'vət etmək lazımdır. Baş bədən üçün necəsə, səbr də iman üçün .elədir. (Nəhcül-bəlağə). Ümid var ki, bu nəsihətlər faydalı olsun

**SUAL ۱۲**

SUAL ۱۲: Bütün müsəlman gənclər, eləcə də mənim üçün bir nəsihət buyurmağınızı .xahiş edirəm

.CAVAB: Bismillahir-rəhmanir-rəhim

Sizə və qəlbi islam nuru ilə münəvvər digər əziz cavanlara təqva, ədəb və dini göstərişlərə bağlılığı tövsiyə edirəm. Tövsiyə edirəm ki, həyatınızın bütün dönəmlərində dininizi hər hansı bir istəyə fəda etməyəsiniz. Əksinə, hər şeyi dininizə .fəda edin

**SUAL ۱۳**

!SUAL ۱۳: Ali məqamlı fəqih həzrət Ayətullah-üzma Safinin mübarək hüzuruna salam

.Xahiş edirəm ki, dünya və axirətim üçün faydalı bir nəsihətlə mənə yol göstərəsiniz

.CAVAB: Bismillahir-rəhmanir-rəhim

Nəsihət istəkli məktubunuz çatdı. Mö'minin mö'min boynunda nəsihət haqqı olduğunu .nəzərə alaraq, aşağıdakı qeydləri təqdim edirəm

Öyüd və nəsihət mö'minlər üçün faydalıdır» (Zariyat-۵۵) ayəsinə əsasən» .nəsihətlərimizin faydalı olacağına ümidliyik

İstər özüm üçün, istərsə də siz və bütün mö'min bacı və qardaşlar üçün ən yaxşı nəsihət təqva və pəhrizkarlıqdır. İmam Baqir (ə) buyurur: «Həqiqətən bir müsəlmanın «.digər bir müsəlmana verdiyi ən yaxşı öyüd pəhrizkarlıqdır

Qiymətli cavanlıq ne'mətinin qədrini bilin. Allahın bəxş etdiyi bacarıq və fürsəti qənimət sayın. Bu dövrün təravətindən gözəl şəkildə istifadə edin. Həzrət Peyğəmbər (s) Əbuzərə vəsiyyətində «nə qədər ki, qocalıq gəlməyib, cavanlığı qənimət bil» deyə .buyurur

Çalışın ki, cavanlıq dövründə qəzəb, şəhvət və nəfs istəklərini ram etməklə özünüzə ağa olun. Bu dövr çalışmaq, özünü düzəltmək, iste'dadların aşkarlanması, kamillik dərəcələrinin fəthi üçün münasib fürsətdir. Heyvani meyllərin güclənməsi də bu dövrə təsadüf edir. Bu dövr ya səadət, behişt, ya da bədbəxtlik və əbədi əzab dövrüdür. Zəhmətlərə qatlaşmaqla bu dövrü Allah, Onun

.(peyğəmbərləri, övliyaları və salehlərin yolunun seyrinə çevirmək lazımdır. (Nisa-۶۹

Müvəffəqiyyət nəsimi yellərinə qucaq açın və nəfslə cihada qalxıb, hidayət və müvəffəqiyyət qazanın. özünüzü büdrəmə və tənəzzül amillərindən hifz edin. Bə'zi amillər Əbu-həmzə Somalinin şərafətli duasından bəyan olunmuşdur: «Mənim ağam! Yoxsa məni öz dərgahından qovub, xidmətində bəndəlikdən məhrum etmisən? Bəlkə, səhlənkarlığımı görüb, özündən uzaqlaşdırdın, üz döndərdiyimi görüb, özbaşına buraxdın? Yoxsa, bəxşişlərin qarşısında minnətdarlıq etmədiyimi görüb, binəsib etdin? Bəlkə, alimlərdən uzaq görüb, xar etdin, qafillərlə görüb, rəhmətindən mə'yus qoydun? Yoxsa, məni batil əməl sahibləri arasında görüb, onların öhdəsinə buraxdın? .((Səhifeyi-səccadiyyə, ۲-ci cild

Yuxarıda sadalanan səbəblər müvəffəqiyyətsizliyin, Allahdan uzaqlığın, qəlb qaranlığı və digər fəsadların səbəbləridir. Bütün bunlar həqiqi fəzilətlərin və mə'nəvi .dərəcələrin kəsbi üçün maneədir

İnsan üçün səadətbəxş xüsusiyyətlərdən biri də layiq nəsihətlər təmənnasıdır. Allah sizin bu mə'nəvi dərkinizi, bəsirətinizi artırsın. Bu halı əldə

etmək üçün Allaha şürk edin. Heç vaxt əxlaqınızı, nəfsinizi boş buraxmayın. Qur’an tilavətində davamlı olun. Ən azı əxlaq, mə’ad, ilahiyyət, maarifə aid hissələri əzbərləyin. Allahı zikr etməklə şeytani xəyalları qovun. «Şeytani xəyallar hücum .(çəkəndə pəhrizkarlar Allahı zikr edirlər» (Ə’raf-۲۰۱

Hal - hazırda elmə yiyələnmək üçün ilahi tövfiqiniz var. Elmi məqamları məqsəd seçin. Cəmiyyətin faydalı bir üzvü olmaq, böyük xidmətlər göstərmək, müsəlmanları yadlara .möhtaclıqdan qurtarmaq üçün bacardıqca çalışın

Hər zaman həzrət Mehdinin (ə.c) zühurunun intizarında olun, onun nurlu könlünü .sevindirən əməllər hazırlayın

.Uca Allahdan sizin üçün tövfiq, dünya və axirət səadəti istəyirəm

**SUAL ۱۴**

.SUAL ۱۴: Xahiş edirəm ki, cavanlar üçün bir nəsihət buyurun

.CAVAB: Bismillahir-rəhmanir-rəhim

Əziz cavanlarımız dövrümüzün saysız-hesabsız azdırıcı də’vət və vasitələrinə diqqətli .olmalı, qeyri-islami tə’sirlər altına düşməməlidirlər

Bilin ki, «ləbbeyk» deyiləsi yeganə də’vət bəşəriyyətin ən ziyalısı, həyat tarixi tam .şəkildə mə’lum olan imamlardır

.İnşəallah müvəffəq olasınız

Qeyd: Ayətullah-üzma Safinin oğlu doktor Mürtəza Safi təhsilini təkmilləşdirmək üçün İngiltərəyə e'zam olundu. O, iki ildən sonra kardioloq ixtisası ilə ölkəyə qayıtdı. Hazırda Tehranın «Şəhid Behişti» institutunun elmi şurasının üzvüdür, «Şəhid Müdərris» xəstəxanasında fəaliyyət göstərir. Aşağıda ixtiyarınıza veriləcək iki məktub Ayətullah-üzma Safi tərəfindən doktor Safiyə və onun həyat yoldaşına ünvanlanmışdır.

**SUAL ۱۵**

.CAVAB: Bismillahir-rəhmanir-rəhim

De ki, işinizi görün, tezliklə Allah, Onun Peyğəmbəri və mö'minlər sizin işinizə» .(baxacaqlar» (Tövbə-۱۰۵

Əziz övladım, gözümün nuru Mürtəza! İndi ki, Allahın köməyi ilə təhsilinin davamı üçün xaricə gedirsən, ümidvaram, müvəffəqiyyət qazanıb, seçdiyin məqsəddə zahirən və .mə'naca ali və mütəali uğurlar əldə edəsən

Uca elmi məqamlara nail olmağı hədəf bil və səfərini Allah üçün yerinə yetir ki, .oxuduqların, zəhmətlərin, tədqiqatların əməl naməni bəzəsin

İslam ümmətinin və müsəlmanların özünə kifayətlənməsi üçün mə'lumat toplamaq .yolunda, müsəlmanlara xidmət naminə səfər müqəddəsdir

Müsəlmanların bu günkü tənəzzülünün sirri onların dəqiq və humanitar elmlərdəki .geriliyidir. Əksinə, kafirlərin üstünlüyü onların həmin elmlərdəki nailiyyətləridir

Əgər xaricə gedən gənclərin hər biri texniki tərəqqi ilə ayaqlaşmaq, islam aləmi üçün .başıucalıq gətirmək fikrində olsa, asılılıq aradan qaldırılar, istiqlal əldə edilər

Axı nə üçün sən və sənin kimilər elm sahələrində dünya miqyaslı bir mütəxəssis olmayasınız?! Halbuki, iste'dad baxımından kimsədən geri deyilsiniz. Məqsədim hansı ali rütbə üçün səfər etdiyini sənə xatırlatmaqdır. Allah səni görür, Ondan kömək istə və .Ona təvəkkül et

Allah eləməmiş, olmasın ki, oranın bərbəzəkli görünüşü səni aldatsın və boş əllə geri dönəsən! Əgər orada təhsil imkanları vardırsa, unutma ki, insanı səadət yolundan !azdıran vasitələr də çoxdur. Aldanmayan, xoşbəxtliyini satmayan kişi gərəkdir

Dini vəzifələrində və Əhli-beyt vilayətində sabitqədəm ol. Bu yolda sınanmış, püxtələşmiş insanlarla ünsiyyətdə ol. Dini yığıncaqlarda xalisliklə, riyasız, feyz .qazanmaq üçün iştirak et və həmin məclislərin qədrini bil

Xülasə, fərz et ki, hamı, bütün müsəlman cəmiyyəti sən və sənin kimilərinin intizarındadır. Dost və tanışların, qohum-əqrəban, ata-ananın gözü yoldadır. Eləcə də, bütün xəstələr! Bütün bunları unutma və müvəffəqiyyətlər yolunda zəhmətləri qəbul et. Qarşıya çətinlik çıxanda e'tina etmə. Sıxıntı və çətinlikləri Allahın ixtiyarında qoy və !ümidsizlikdən çəkin

Bacardıqca dilində Allahı zikr et, qəlbdə xatırlamağı da unutma. Məhəmməd və ali Məhəmmədə, xüsusi ilə həzrət Mehdiyə (ə.c) salavat hədiyyə etməyi yaddan çıxartma. O həzrət və onun işlərinə yaxşı xidmət üçün təhsilinə diqqətli ol. Artıq macal olmadığı üçün uyğun mövzularda daha geniş mütaliə edəcəyinə ümid bəsləyirəm. Səni Allaha .tapşırıram və Ondan sənin üçün dünya və axirət səadəti, tövfiq diləyirəm

**SUAL ۱۶**

.Cavab ۱۶: Bismillahir-rəhmanir-rəhim

Bu bir neçə kəlməni də gözümün nuru Nərgiz və onun möhtərəm anası üçün yazıram. Sizin və Mürtəzanın sağ-salamatlığına, vətənə müvəffəqiyyətlə qayıdacağınıza ümid .edirəm

Əzizlərim, getdiyiniz şəhər fəsad, əxlaqsızlıq, günahla doludur. Onların insaniyyətdən dəm vurmalarına baxmayaraq, orada insan şərəfi heyvani şəhvət və həvəslərin .tapdağıdır

Əksəriyyətinin həyatı heyvanxanalarda cərgələnmiş heyvanların həyatına bənzəyir. Öz əxlaqınızı, dini istiqlalınızı qorumağa çalışın. Uyğun mühitdə çox müsəlmanlar öz rənglərini dəyişirlər. Müsəlman olduqlarını unudaraq, qadınlar çadranı kənara qoyurlar. Əksinə, hindistanlılar, pakistanlılar və afrikalılar öz şəxsiyyətini qoruyur, milli .geyimlərdə görünməkdən çəkinmirlər

Hər halda yaşayış cihaddır. Dərs də, islami örtük də, bayağı məclislərdən uzaq olmaq !da cihaddır. Cihad, cihad, cihad

Ümid edirəm ki, bütün cihadlarda qalib olacaqsınız və balaca Nərgiz də öz kiçik çadrası ilə islami simvollara bağlılıq nümunəsi olacaq. Xülasə, şər'i cəhətdən yaxşıları götürün, !pislərdən uzaq olun

**SUAL ١٧**

.SUAL ١٧: Həzrət Ayətullah-üzma Safinin hüzuruna

Təhsil ocaqlarından birinin müdiri mütəmadi şəkildə dörd yüz nəfərlik bir cəmiyyətin qarşısında «səsinizi kəsin» sözünü işlədir. Tağuta məxsus, əxlaqa zidd belə bir sözün ?işlədilməsinə şəriətin münasibəti necədir? Şagirdlərin və məs'ulların vəzifəsi nədir

.Cavab ١٧: Bismillahir-rəhmanir-rəhim

İslamda elm təhsili və tədrisi tə'kid olunmuş mövzulardan olub, cəmiyyətin tərəqqisinin əsasını təşkil edir. İnsana elm öyrədib, onu doğru yola hidayət edənlərin haqqı böyükdür və bu haqq atanın haqqına uyğundur. Şagirdlər müəllimə ehtiram .göstərməli, hətta onun nöqsanlı davranışına da dözməlidirlər

Eləcə də, müəllim və ustadın vəzifəsi şagirdlərdə mehriban davranmaq, onların qüsurlarını nəzakətli qaydada islah etməkdir. Şagird və müəllim əlaqəsi heç zaman unudulmayan mə'nəvi bir əlaqədir. Hədisdə buyurulur ki, «elm öyrədən və elm öyrənən şəxslərin qarşısında təvazökarlıq edin» (Mişkatul-ənvar). Bu hədis şagirdə sadə olub, müəllimə ehtiram göstərməyi və müəllimə məhəbbət və təvazökarlıqla ilə şagirdi həvəsləndirməyi tövsiyə edir. Nəticədə, şagirdin elm və mə'rifətə rəğbəti .artmalı, çətinlik zamanı həvəslə müəllimə üz tutmalıdır

Şagirdlərin vəzifəsi budur ki, müəllimi qəzəbləndirəcək davranışa yol verməsinlər, danlaq zamanı müəllimə qarşı çıxmasınlar. «Müəllimin cəfası atanın nəvazişindən .üstündür» buyuruğuna riayət olunsun

Məs'ulların vəzifəsi müəllim və ustadların əxlaq və rəftarını şərafətləndirmək, onların ,nöqsanlarını

şagirdlərin ruhiyyəsinə mənfi tə'sir göstərən pis davranışlarını başa salıb, onların .müəllim adını uca tutmasına çağırmaqdır

## SUAL ۱۸

SUAL ۱۸: Ali məqamlı fəqih həzrət Ayətullah-üzma Safi Gülpayiqaninin hüzuruna. Salam! Xahiş edirəm, ilk dərs ilimdə məni öz göstərişlərinizlə peyğəmbər peşəsi olan .müəllimliyə həvəsləndirəsiniz

.CAVAB: Bismillahir-rəhmanir-rəhim

İşinizə başlayarkən onun müqəddəsliyinə yetirdiyiniz diqqət və gözəl niyyətinizi dəyərləndirməklə, müvəffəqiyyət qapılarının üzünüzə açılmasını Allahdan diləyirəm. İmam Mehdinin (ə.c) sayəsi altında uğur qazanıb, onun dostlarından və .köməkçilərindən olasınız

Şərəfli müəllim peşəsi ağlın və şəriətin ehtiramını qazanmış peşələrdən olub, bütün müəllimlər arasında təqdir olunmuşdur. Qur'ani-kərimdə buyurulduğuna görə bütün insanların, həzrət Adəmin, eləcə də həzrət Məhəmmədin (s) müəllimi Allah-taala .özüdür

Əzəmətli peyğəmbərlərin ən böyük vəzifələrindən biri də tə'lim və tərbiyədir. Həzrət «.Rəsulullah (s) özü haqqında buyurur: «Yalnız müəllimlik üçün seçildim

həzrət Əli (ə) və digər imamlar ilahi cəmiyyətdə tə'lim və tərbiyə sifətinin məzhəridirlər. Mədrəsə, elmin bəyanı, maarif, o əzəmətli şəxslərin hökmləri ilkin islam dövründən bu günədək genişlənmişdir. İslam mədrəsəsi yeganə təhsil ocağıdır ki, onda minlərlə müəllimlər təhsil alıb, dünyanın müxtəlif nöqtələrində, şəhər və .kəndlərində, məscid və hüseyniyyələrdə elmə qatılmışlar

İki ay, məhərrəm və səfər ayları boyunca islam aləmi həzrət Seyyidüş-şühəda imam Hüseyn (ə) əzadarlıq mərasimi keçirir. Bütün tə'lim-tərbiyə ocaqları bu mərasimlərin kəramətindən çiçəklənir. Bir zaman Mədinə məscidində imam Hüseynə (ə) məxsus .dərslər qurular, səhabə və ardıcıllar belə bir müəllimdən dərs alardılar

Aydındır ki, söhbətin faydalı elmlərdən getdiyini qeyd etməyə ehtiyac qalmır. Qur'an, əhkam, əxlaq, üsul, ədəbiyyat, tarix, biologiya, fizika, kimya, riyaziyyat və s. müəllimlərinin hər biri fəzilətlidir. Bütün bu tə'limlər cəmiyyətə xidmət, islamın izzəti, .biganələrdən ehtiyacsızlığı, ilahi razılıq əldə edilməsi üçün yerinə yetirilə bilər

Müəllim müqəddəs hədəf, yüksək şüur və düşüncə ilə tədris edərsə, bu iş heç bir dünya malı ilə müqayisə edilə bilməz. Bu yolda niyyət xalis olduqca işin mə'nəvi dəyəri .də artır

Həzrət imam Cə’fər Sadiq (ə) məktəbində minlərlə alim, hədisçi, təfsirçi və mütəxəssislər yetişmişdir. «Kimya elminin atası» ləqəbini almış Cabir ibni Həyyan da bu .şəxslər arasındadır

İslami cəmiyyətdə tədris, müəllim, müəllimin məqamı və şə’nindən danışılanda adı çəkilən bütün elmlər nəzərdə tutulur. İslam, Qur’an, şəriət elmlərinin xüsusi məqamı olsa da, dini kamilliyi, dünya həyatının nizamlanması, cəhalətin aradan qaldırılmasında bütün digər elmlərin rolu vardır. Eləcə də, müəllim ixtisasından asılı olmayaraq, şagirdləri islam, mə’rifət, Əhli-beytlə tanış edə bilir. Müəllimlik sənəti şagirdlərin doğru yola yönəldilməsi üçün gözəl bir imkan yaradır. Əksinə, müəllim sağlam əqidəyə malik .olmazsa, şagirdlərin əqidə və əxlaqına mənfi tə’sir göstərə bilər

Eləcə də, fəsad törədən, pozucu sahələr vardır ki, onların tədrisi günahdır. Peyğəmbər .və imamlarla həmfikirlik, onlardan ilhamlanmaq müəllimin axirətinə tə’minat verir

Ümid var ki, tə’lim-tərbiyə ocaqlarımız ilahi hökmlər və Qur’an tə’limləri sayəsində cəmiyyəti tərəqqi və inkişafa çatdırsınlar. Eləcə də, əziz müəllimlər öhdəyə götürdükləri böyük vəzifəni

.layiqincə yerinə yetirib, ilahi dəyərlərin keşiyində duranlardan olsunlar

Möhtərəm və əziz müəllimlərə, xüsusi ilə də bu fəaliyyətə yenicə başlayanlara nəsihətim budur ki, öz işləri ilə Allah razılığını qazanmaq istiqamətində iradəli olsunlar. Şagirdlərlə təvazökar və mehriban rəftar, tapşırılmış əmanətin yaxşıca qorunması .müəllim ömrünü bütün cəmiyyət üçün faydalı edər

Onu da qeyd edək ki, müəllimin ədəb və əxlaqı, rəftarı və danışıq üslubu, hətta geyimi və çöhrəsi də şagirdə tə'sir edir. Ailədən sonra insan üçün ən tə'sirli mühit məktəb .(mühitidir. «Yaxşı yerin torpağı yaxşı, pis yerin torpağı pis bitkilər bitirər» (Ə'raf-۵۸

Bütün bu məs'uliyyətlər nəzərə alınarsa, dərs otağını ibadət otağı, müəllimlik .fəaliyyəti ibadət hesab oluna bilər

!Kaş, sizinlə olub, böyük iftixara çataydıq

**SUAL ۱۹**

!SUAL ۱۹: Ayətullah-üzma Safinin nəzərinə. E'tiram və salamla

?Özümü düzəltmək üçün nə etməliyəm.۱

?Şeytanı qovmaq üçün ən yaxşı yol hansıdır.۲

.CAVAB: Bismillahir-rəhmanir-rəhim

Birinci sualın cavabında deyə bilərəm ki, özünü düzəltmək üçün şəriət göstərişlərinə ,əməl etmək

ən azı haramlardan çəkinib, vacibatı yerinə yetirmək lazımdır. Özünütərbiyənin ən ali dərəcəsi bəyənilmiş işlərin icrası, pislənmiş əməllərin tərkidir. Çünki özünütərbiyənin mə’nası insanın səadətinə tə’minat verən yaşayış tərzinə əməl olunmasıdır. Belə bir .həyat tərzini isə yalnız insanı vücuda gətirmiş Allahdan öyrənmək olar

İkinci suala cavab: Şeytanın rədd edilməsi üçün ən münasib yol həyatın istisna, mühüm döngəsində səbr edib, düşünməkdir. Bu dayanacaq bir yerdədir və insan bütün işlərini bu dönmədə icra edir. İnsanın qarşısına çıxan, eləcə də, imamların xəbər verdiyi məqama diqqət edilməlidir. Əlbəttə ki, Allahın zikri, mə’nasına diqqət .yetirməklə dualar oxumaq da tə’sirlidir

**SUAL ٢٠**

SUAL ٢٠: Həzrət Ayətullah-üzma Safi Gülpayiqaninin hüzuruna. Salam! Xahiş edirəm ki, .kamilliyə çatmağın mərhələləri haqqında nəzərinizi buyurasınız

.CAVAB: Bismillahir-rəhmanir-rəhim

Kamillik mərhələlərinin yolu müxtəlif şəxslər üçün fərqlidir. Çünki insanların iste’dadı, məhdudiyyətlərə dözüm səviyyəsi zatən və fitrətən fərqlidir. Hər kəs öz fitri ,qabiliyyətləri çərçivəsində kamillik əldə edə bilər. Hər halda

.kamillik istəyində olan hər bir şəxs müəyyən mərhələlər keçməlidir

İlkin mərhələdə Allahı tanımaq istiqamətində kitablarda qeyd olunmuş dəlilləri düşünməklə ilahi sifətlər və Allahın öz qulundan agah olduğu dərk edilməlidir.

.(Allah) gözlərin xəyanətini və qəlblərin gizlətdiyini bilir» (Ğafir-۱۹)»

Bu tanışlıq ilahi razılığın tanınıb, əldə edilməsinə gətirir. Bu iş yalnız Allahın özü ilə bəndələri arasında vasitə etdiyi şəxsləri tanımaqla mümkündür. Həmin şəxslər Allahın razılıq və qəzəb mövqeyini, hansı əməllərin itaət, hansı əməllərin müxalifət olduğunu lazımınca bilirlər. Onlar ilahi elmlər xəzinəsi, Allahın əmanətçiləridir. Onların əxlaq və əməlini, buyuruqlarını düşündükcə ilahi əsaslarla tanışlıq bir o qədər artır. Əgər bu tanışlıq sadəcə bilik çərçivəsində qalamayıb, ilahi hökmlərə itaətlə yanaşı olarsa, faydalıdır. Lakin sadalanan biliklərə e'tiqaddan uzaq elmi tanışlıq Allahdan uzaqlaşmağa, bədbəxtliyə, daşürəkliliyə və pis aqibətə səbəb olur.

Allah-taala bizi və sizi, Məhəmməd və onun ailəsi xatirinə, Allah və Onun övliyalarını tanımaq yolunda müvəffəqiyyətə çatdırsın.

**SUAL ٢١**

!SUAL ٢١: Ayətullah-üzma Safinin hüzuruna. Salam

Ailə həyatı qurmazdan qabaq musiqiyə həvəsli və örtüksüz idim. İndi isə musiqidən uzaqlaşmışam, örtüyüm qaydasındadır. Ən əsası isə Qur’an oxuyuram (Allahın və həyat yoldaşımın köməyi ilə). Amma hələ də Şeytan yaxamı buraxmır, süst və iradəsiz olduğumdan ardıcıl şəkildə namaz qıla bilmirəm. Vicdan əzabı çəkir, narahat oluram. ?Möhkəm iman və iradə əldə etmək üçün, Şeytandan uzaqlaşmaq üçün nə etməliyəm

.CAVAB: Bismillahir-rəhmanir-rəhim

Musiqini həmişəlik qoyun kənara. Mütləq namazı qılın və bu vaxtadək qılmadıqlarınızın qəzasını yerinə yetirin. Rəvayətdə buyurulur ki, «namazı bilərəkdən tərk edən şəxs «.kafir kimidir

Allahın əzəmətini, ölümü, qəbr sorğusunu yaxşıca fikirləşsəniz, Allaha itaətin savablarını diqqət mərkəzində saxlasanız, inşaəllah şeytan yaxanızı buraxar. Bunu da bilməlisiniz ki, insan yalnız kamil iman və mə’rifət hesabına şeytan hiyləsindən və nəfs istəklərindən qurtula bilər. Belə bir kamillik isə Allahın əzəmətini düşünmək, bu əzəmət qarşısında müt’ilik, əzab və savabın

.mütləq olmasına yəqinlik, əmrlərə itaət və qadağalardan çəkinməklə əldə edilir

**SUAL ٢٢**

SUAL ٢٢: Bismillahir-rəhmanir-rəhim. Həzrət Ayətullah-üzma hacı şeyx Lütfüllah Safi !Gülpayiqaninin hüzuruna. Salam

?Dost-tanışla davranmaq barəsində şəriətin hökmü nədir

.CAVAB: Bismillahir-rəhmanir-rəhim

Şəxsiyyətin formalaşmasında ən tə’sirli amillərdən olan dost seçiminə diqqətli olmaq lazımdır. Elə şəxslərlə ünsiyyətdə olmaq lazımdır ki, bu ünsiyyətdən ruhani və mə’nəvi .faydalar əldə edilsin

Alimlər, zahid insanlar, sınanmış mö’minlərlə oturub-durmaq iman və əqlin inkişafına səbəb olur. Əksinə, günahkar, əxlaqsız, dini göstərişlərdən qaçan, həyasız, azğın adamlarla ünsiyyət olduqca zərərlidir. Belə şəxslərin iştirak etdiyi zərərli məclislərə qatılmaq olmaz. Eləcə də, məzhəbi yığıncaqları, Qur’an və dua məclislərini qənimət .bilmək lazımdır. «Hər kəs öz yoldaşı ilə tanınar» – buyuruğunu unutmayaq

**SUAL ٢٣**

!SUAL ٢٣: Həzrət Ayətullah-üzma Safinin hüzuruna. Salam

Bir gənc, Allah və mə'sum imamlarla necə əlaqə qura bilər? Əgər onun qəlbini ?ümidsizlik çulğasa, nə etməlidir

.CAVAB: Bismillahir-rəhmanir-rəhim

Gündəlik həyatın bütün sahələrində Allah və mə'sumların buyuruqlarına lazım olduğu .səviyyədə əməl etmək onlarla əlaqə qurmaqdır

**SUAL ۲۴**

.SUAL ۲۴: Bismillahir-rəhmanir-rəhim

!Möhtərəm fəqih həzrət Ayətullah-üzma Safi Gülpayiqaninin hüzuruna. Salam

Gənclərin zahiri dünya həyatı ilə çiyin-çiyinə sirli bir daxili aləmləri də vardır. Bu daxili aləm diqqətdən kənarda qalıb, unudulasa da, insan həqiqi əqidə və düşüncələrə, gözəl əxlaqa və əməllərə bağlanaraq ruhani aləmini hərəkətə gətirib, öz səadətini tə'min edə bilər. Təəssüf ki, əgər cavanlar əxlaqsız və ləyaqətsiz əməllərə həvəs göstərməklə bədbəxtçiliyə düçar olmuşlar. Belələrinin doğru yola yönəldilməsi, onların zatı həqiqətlərinin dirçəlməsi, ruhaniyyət aləminə qayıtmasını gərəkli bilirəm. Əgər onlar bütün mə'nəvi kamillikləri heyvani qüvvələrin razılığına qurban versələr, nəfsani istəklərinə əsir olub, qızmış bir yırtıcıya dönsələr, şəksiz ki, bədbəxtlik çölündə sərgərdan qalacaqlar. Əgər çox az sayda insanlar özlərini kamilləşdirmək üçün çalışarsa və

ibtidai məktəblərdə qızlar və oğlanlar həlakət vadisində vurnuxarlarsa, həqiqət .yolundan sapanların aqibəti sözsüz ki, cəhənnəm olacaqdır

Biz, gənclər arasındakı belə fitnə-fəsadların çoxundan xəbərsiz qalırıq və bu .azğınlıqlar sadəcə ədliyyə sənədlərində arxivləşdirilir

Cinsi azğınlığı qızışdıran amil açıq-aşkar mə'nəviyyatsızlıqdır. Biz yalnız özümüzə diqqət yetiririk və dini baxışlarımız öz dairəmizdən çıxmır. Hər hansı bir ölkədə mə'nəviyyat tənəzzülə uğradıqca cəmiyyətdə ictimai pozğunluq, ən başlıcası isə cinsi azğınlıq çoxalır. Belə bir mühitdə haqq və iman yolunu sevən, azğınlıqlardan narahat olan gənclər pis tə'sir altına düşür, özlərini itirirlər. Belə gənclər düzgün yolu .seçməkdə məsləhət üçün heç bir kəsə, hətta ata-analarına belə e'timad göstərmirlər

Mən illər uzunu məktəblərdə azğınlıqları, ۱۶-۱۷ yaşdan aşağı oğlan və qızların telefon əlaqələrini, get-gəllərini müşahidə etdikdən sonra bu qənaətə gəldim ki, gənclər nə qədər ağıllı və düşüncəli olsalar da, iman və əxlaq yoxsulluğu onları tez-gec yırtıcı pozğunluqların pəncəsinə verəcək. Zənnimcə əsas səbəbkar ata-analarıdır.
Pozğunçluqlarla mübarizənin zəruriliyini düşünürəm və sizdən kömək istəyirəm. Bu

.mövzuda kitab göndərməklə də olsa, mənə əl tutun

Allahın və sizin köməyinizlə, gənclər arasında vərəqələr yaymaq yolu ilə müvəffəqiyyət qazanmaq olarmı? Onların düşüncələrinin islahı üçün hansı mə’lumatları vermək lazımdır? Onu da qeyd edim ki, mənim bu sahədə heç bir vəzifə və məs’uliyyətim yoxdur. Məni kiçik bir şəxs kimi qəbul edib, məktubuma cavab verin. Bu məktubu əhəmiyyətsiz saymaq imam Zamanın (ə.c) cəmiyyətini və Qur’anı .əhəmiyyətsiz saymaqdır

Sizin məhəbbət dolu cavabınızın intizarındayam. Bir xahişim də budur ki, feyzlə dolu .ramazan ayına yaxınlaşdığımız üçün cavabı tez göndərəsiniz

Hədisdə buyurulur: «Allah evini yeddi dövrə təvaf edən şəxsə Allah-taala altı min yaxşılıq yazar, onun altı min günahını silər, onun üçün altı min dərəcə ucaldar və onun altı min istəyini yerinə yetirər. Lakin mö’minin istəyini yerinə yetirmək on dəfə .(təvafdan üstündür» (Hilyətül-müttəqin

.İnşaəllah, hər zaman həzrət Mehdinin (ə.c) lütf və inayətindən faydalanasınız

.CAVAB: Bismillahir-rəhmanir-rəhim

.Sizin geniş və dəyərli, cəmiyyət və islam övladları üçün ürəyiyanan məktubunuz çatdı

Cavabın gecikməsi işin çoxluğu, yazılı və şifahi məsələlərdə kitablara müraciət etmək zərurətindən oldu. Öz dediyiniz kimi məktub yazanın bir təşkilat və ya adi bir şəxs olması əhəmiyyət daşımır. Cavablarda ən çox vəzifənin icrası, islam maarifinin yayılması, cəmiyyətin və xüsusi ilə də gənc nəslin agahlığının yüksəlməsinə diqqət .yetirilmişdir

Gənclərin problemləri həmişə tərbiyəçilərin, müəllimlərin, xüsusilə də peyğəmbərlərin və islam məktəbinin diqqət mərkəzində olmuşdur. İslahatçılar, qurucular, iqtisadi proqnozlar, iman və əqidə təbliğatları gənclərin üzərində mərkəzləşmişdir. İstər .millətlərin süqutuna, istərsə də səadətinə çalışanlar bu təbəqəyə kapital qoyurlar

Gəncliyin ruhiyyəsi müsbət və ya mənfi istiqamətdə fəaliyyət və fədakarlığa hazırdır. Gənclərə həsr olunmuş, onların istəklərinin ilahi əsaslarla tə'mini mövzusunda kitab .və risalələrə ehtiyac çoxdur

Əsrimizdə informasiya və nəşriyyat, canlı və cansız təbliğat vasitələrinin qloballaşması səbəbindən bir gəncin sağlam mə'nəviyyatda

qalması üçün xeyli zəhmətlər tələb olunur. Siyasət, iqtisad, mədəniyyət adı altında qeyri-insani təbliğatlar baş alıb gedir. Jurnal və qəzetlər, radio və televiziya yayımları bəşəriyyəti ardınca sürükləyən mühüm amillərdəndir. Bu vasitələr şəhərliyə-kəndiliyə, qocaya-cavana baxmadan hamını və hər yeri əhatə edir. Mavi ekrandakı jest və mimikalar, geyimlər dünyanın ən ucqar nöqtəsindəki oğlan və qızları öz tə'siri altında saxlayır. Sözsüz ki, saf müsəlman bir gəncin formalaşmasında ailə, məktəb, cəmiyyətin əhəmiyyətli tə'sirləri vardır. Necə ki, Qur'anda buyurulur: «Təmiz bir yurdun bitkiləri Allahın izni ilə bitər. Pis bir yurdun bitkiləri isə yalnız çətinliklə göyərər» .((Ə'raf-۵۸

Nə vaxtsa hər hansı gəncin mühiti bir şəhər və ya bir kənd mühitində məhdudlaşırdı. Bu günki tərbiyə mühiti isə bütün dünyadır. Dünyadakı qarışıqlıqlar və əxlaqsızlıq təbliğatı uyğun mühiti dözülməz edirsə də, çarə yoxdur deyə, oturmaq olmaz. Bu problemlər qarşısında tərbiyə üsulları da çoxdur. Həmçinin müasir dünyamızda gəncliyin şüurunun inkişafı müsbət təbliğatın gerçəkləşməsi üçün şərait yaradır. Gənclər üzərində əhatəli və kamil formada təbliğat lazımdır. Onların problemləri araşdırılmalı

cəmiyyətin, məktəbin məs'ulları və valideynlər əl-ələ verib, bu problemləri həll .etməlidirlər

Yada saldığınız cinsi problemlərin həlli üçün müqəddəs islam dini evlənmənin əhəmiyyətini tə'kidlə vurğulayır. Hədisdə buyurulur: «Ailə həyatı quran şəxs öz dininin yarısını hifz etmişdir» (Kafi, ۵-ci cild). Bir nəfərin ailə qurması üçün atılan addım gecələri namaz, gündüzləri orucla keçmiş bir ilin ibadətinin savabı ilə dəyərləndirilir. Bununla .islam imkan həddində gənclərin mə'nəviyyatını hifz edir

İslam fəsad törədən müsabiqələri, oyunları, filmləri, kitabları, qəzet və jurnalları, haram musiqi və qumarı, əxlaqsız insanlarla ünsiyyəti qadağan etməklə faydalı .düşüncə və təhsil üçün şərait hazırlayır

Bizim əqidəmizcə, islam bütün problemlərin həlli yolunu bəyan etmişdir və mövcud azğınlıqlar islama arxa çevrilməsindən doğur. İslami cəmiyyət gənclərin səadəti üçün .imkan daxilində şərait yaradan bir cəmiyyətdir

Cəmiyyətə və xüsusi ilə də təbliğat vasitələrinə rəhbərlik edənlər səhlənkarlığa yol .verməməli və bu səhlənkarlığı islama, vətənə, millətə xəyanət bilməlidirlər

İnformasiya vasitələrinin öhdəlikləri çox ağırdır. Haqqın və ədalətin, mə’nəviyyat və düzgünlüyün təbliği başlıca vəzifə olmalıdır. Gəncləri söhbətlər, əxlaqi yığıncaqlar, .təfsir və dua məclisləri vasitəsi ilə doğru yolda saxlamaq lazımdır

Allaha şükr olsun ki, şiə maarifində, islam mədəniyyətində gənclərə və yeniyetmələrə ünvanlanmış nəsihətlər təsəvvür olunduğundan da çoxdur – ayələr, hədislər, dualar, kitablar, məqalə və şe’rlər bu qəbildəndir. Gəncləri bu varlı mədəniyyətə yönəltmək, .onları əməllərinin hesabatına məşğul olmağa çağırmaq lazımdır

Nəhayət, əziz on doqquz yaşlı gənc! Şükürlər olsun ki, bütün bu biliklərə maliksən. Mən !sizi təbrik edir və sizin kimilərin çoxluğunu Allahdan diləyirəm

Siz gənclər islamın gələcəyisiniz. İslamın əzəmət və şövkəti sizdən asılıdır. Hamının sizdən intizarı var – İslamın, Qur’anın, həzrət Bəqiyyətullahın (ə.c)! o həzrətin əksər .köməkçiləri siz müsəlman və əhd bağlamış gənclər olacaqsınız

Əzizlərim! Əgər sizə münasibətdə biz öz vəzifələrimizi lazımınca yerinə yetirə bilmiriksə, özünüz hərəkət edin. Allah sizə yar olsun! «De ki, işinizdə olun, onsuz da elədiklərinizi Allah, səh:۶۶

.(Onun rəsulu və mö'minlər görəcəklər» (Tövbə-۱۰۵

**SUAL ۲۵**

SUAL ۲۵: Əzəmətli fəqih həzrət Ayətullah-üzma Safi Gülpayiqaninin müqəddəs !hüzuruna. Salam

Bizim ailə üzvlərindən biri qərb vurğunu olub, xaç və it mücəssəməsinə həvəs göstərir. .Ata-anamın nəsihətləri ona tə'sir etmir

?Sizin nəzərinizcə, bu işin İslam ruhu ilə uyğunluğu varmı.۱

?Naməhrəm kişi ilə dostluq və ona meyl islam nöqteyi-nəzərincə düzgündürmü.۲

?Ailə qurmaq istədiyim bir adamla görüşə bilərəmmi.۳

.CAVAB: Bismillahir-rəhmanir-rəhim

Ümid olunur ki, siz və əsrimizdə sınaq meydanında qərar tutmuş digər xanımlar, Allahın tövfiqi ilə, bu imtahandan üzü ağ çıxıb, islami şəxsiyyətinizi qoruyasınız. Dövrümüzdə qadınların məs'uliyyəti çox mühümdür. Onların Qur'an tə'limlərini, .peyğəmbər və imamların yolunu rəhbər tutması olduqca tə'sirlidir

Birinci sualınızda açıqlanmış məsələ böyük təəssüf doğurur. Necə də ürəksıxıcıdır ki, müsəlman və müvəhhid bir mühitdə boya-başa çatmış, «Əllahu əkbər» və azan səsi ,eşitmiş bir qız özünü bu dərəcədə biganələrə təslim etməklə

məsihiyyət simvolu olan xaça, murdarlıq nişanəsi olan itə rəğbət bəsləyir və öyüd-nəsihət eşitmir. Müsəlman cəmiyyətində qərbpərəstliyin bu həddə çatması təəssüf .doğurur

Həmin qızın həvəsləri biganələr qarşısında zəifliyin nişanəsidir. O, bu simvollarla öz zəifliyini aradan qaldırmaq istəsə də, əslində qeyri-kamilliyini, çaşqınlığını izhar edir. Bu sayaq təzahürlərin yaranmasında pozucu təbliğatların tə’sirini qeyd etməklə kifayətlənirəm. Siz və sizin kimi digər xanımlar səthi mütaliə ilə bu sayaq eybəcər .əlamətlərin cəmiyyətimizə necə yol tapdığını anlaya bilərsiniz

İkinci sualınıza işarə ilə bildirirəm ki, kənar kişi ilə rabitə şəriətin müəyyən etdiyi çərçivədən kənara çıxmamalıdır. Naməhrəm kişi ilə ünsiyyətin sonu peşimanlıq ola bilər. Bu sayaq rabitələrin hesabına bir çox subay qızlar iffət və paklığın sərhəddini aşmış, mədəniyyət adı altında gizlənən təkliflərə aldanaraq bədbəxtliyə düçar .olmuşlar

Qeyd etdiyiniz münasibətlər ölçü-biçisizdir. Bu sayaq münasibətlərə gənclik dövründə təsadüf olunsa da, valideynlərin, oğlan və qızı sehirləmiş aldadıcı hisslərdən azad .təcrübəli şəxslərin məsləhətləri zəruridir

səh:۶۸

Səadət istəyirsinizsə, ailə qurmaq arzularınızı ata-ananıza bildirin. Onlar razılaşmasalar, narahat olmayın. Axı hansı ata-ana öz övladı üçün səadət istəməz?! .Sadəcə, bu işdə onların təcrübəsi və agahlığı çoxdur

Sizə və digər gənclərə yaşınızın bu dövründə diqqətli olmağı, gələcək səadətinizə .inanmağı tövsiyə edirəm

Üçüncü suala gəldikdə isə, bildirməliyəm ki, izdivac niyyəti ilə kimsəyə baxmaq və onunla görüşmək şər'i həddi aşmamalıdır. Evlənmə adı ilə naməhrəm kişiyə yaxınlaşmaq olmaz. Sənəti və qazancı haram olan şəxslə ailə qurmaq qadağan olmasa da, bu iş müsəlman qadın üçün xoş gələcək və'd etmir. Hər bir müsəlman haram mal, haram geyim, haram yeməkdən çəkinməlidir. Əgər evlənməzdən qabaq .haram işdən əl çəkərsə, onunla ailə qurmaq olar

Uca Allah sizi və bütün müsəlman xanımları islam, iffət və hicab yolunda sabitqədəm .etsin

**SUAL ۲۶**

!SUAL ۲۶: Cənab Ayətullah-üzma Safinin hüzuruna. Salam

İki ildir sizə məktub yazmaq niyyətim var. Müəyyən səbəblərdən yubandım və .nəhayət, bu gün özümü sual zindanından qurtarmaq qərarına gəldim

səh:۶۹

Mənim rəssamlığa böyük həvəsim var. Bu yaxınlarda ailə qurmuşam. Həyat yoldaşım bizimlə yaşayır. sualım budur ki, mənim bütün işlərimə nəzarət etməyə onun haqqı vardırmı? İnstitutda mənim rəssamlığı davam etdirməyim üçün şərait var. Ərim mənə rəssamlıqla məşğul olmağı qadağan edib. Mən yenə də bu işlə məşğul ola bilərəmmi? Onun dəlili budur ki, rəssamlıq mənim işimə mane ola bilər. Nə qədər çalışmışamsa da razı olmayıb. Hələ ki, atamın evindəyəm. Mənim məs'uliyyətim atamın, yoxsa ərimin öhdəsindədir? Ərim məni təhsildən məhrum edə bilərmi? Mənim keçmişimin ona aidiyyatı varmı? Anadan olandan ailə quranadək həyatımın bütün xırdalıqlarını ona danışmışam. Bəlkə də, özümü ona olduğum kimi tanıtdıra bilməmişəm. Axı özümü tam tanımadığım, daxili çəkişmələr içində olduğum zaman necə tanıtdıra bilərdim? Hər ikimiz şər'i, islami qanunlara əməl etmək istəyirik. Nümunəvi qadın olmaq üçün nə etməliyəm? Bilirəm ki, mütaliə etməli, həzrət Zəhranı (s) özümə nümunə götürməliyəm. Bununla belə sizin köməyinizə ehtiyacım var. Mən ərimdən gizli rəssamlığa davam edə bilərəmmi? Gün uzunu baş verən hadisələri ona danışmağım ?zəruridirmi

Eyni zamanda, ərim pak və sağlam bir gəncdir. Mən onu özüm üçün Allah hədiyyəsi .bilirəm

.Cavabınızın intizarındayam

.CAVAB: Bismillahir-rəhmanir-rəhim

Allahın böyük nişanələrindən, yaranış aləmindəki incəliklərdən, gözaçan agahlıqlardan biri evlənmək, qadın və kişinin bir-birlərinə munis olmalarıdır. Bu cütlüyü layiqincə ifadə edən bir söz tapa bilmirəm. Qur'anda buyurulur: «Onlar sizin libasınızdır, siz də onların» (Bəqərə-١٨٧). Başqa bir ayədə buyurulur: «Sizin özünüzdən sizin üçün taylar yaratmışıq ki, onlarla rahatlıq tapasınız» (Rum-٢١). Özünüzdən özünüz üçün yaratdı. Həmdəm, munis, həmdərd yaratdı. İslam bu izdivac, kamilləşməyə böyük əhəmiyyət verir və fitrətlərdə mövcud ehtiyacı bir daha nəzərə çatdırır. Ailə özülünü .möhkəmliyinə, qadın və kişinin vəfadarlığına xüsusi diqqət yetirilir

Mən öz həyat təcrübəmdə nümunə olası ailələr görmüşəm. Sanki onlar bir-birlərinin ürəyini oxuyur, bir-birinin istəyinə danışıqsız əməl edirdilər. Bizim dövrümüzdə nə .pozulmuş hüquqlar uğrunda mübarizə, nə icbari kişi ağalığı vardır

Deməк istəyirəm ki, Allahdan hədiyyə saydığınız yoldaşınızla heç bir probleminiz .olmayacaq

.Qarşılıqlı istəyiniz bütün işləri yoluna qoyacaq. Siz onun, o, da sizin xatirinizi istəyəcək

Hər halda ər-arvad münasibətlərinin nizamlanması üçün qanunlar və hüquqlar müəyyənləşdirilmişdir. Bu hüquqlara əsasən nə kişi, nə də arvad evlənərkən öz .keçmişlərini danışmağa borclu deyillər

Ata evində kimin öhdəsində olmağınızla bağlı suala gəldikdə güzəşt və məsləhətlə .keçinməyiniz məqsədə uyğundur

Mö'min kişi ailə və uşağının istəyinə uyğun yemək yeyirsə, münafiq kişi bu işdə yalnız» .öz rə'yini əsas götürür» (Kafi, ٢-ci cild). Qadın da ərinin razılığı üçün çalışmalıdır

Ümid edirəm ki, hərarətli münasibətləriniz bu söhbətdən sonra daha da .hərarətlənəcək. Allah aranızda ülfət yaradıb, nəslinizi paklasın

## SUAL ٢٧

!SUAL ٢٧: Həzrət Ayətullah-üzma Safinin hüzuruna. Salam

Həyat yoldaşı seçməkdə çətinlik çəkirəm. Allahın razı olduğu, şəriətin qəbul etdiyi, məni islami hədəflərə və səadətə çatdıracaq bir qadınla evlənmək barədə düşünürəm. Me'yarlarım həmfikirlik, əqidə birliyi, ruhən yaxınlıqdır. Sərvət, gözəllik, təhsil mənim üçün əhəmiyyətsizdir. Əlbəttə ki, həyat yoldaşının gözəl, təhsilli olması

hamının istəyidir. Amma məncə fikir və əqidə birliyi olarsa, digər məsələlər öz-özünə həll olar. Mənim ailə qurmaq haqqında işıqlı fikirlərim var. Ömrümün sonunadək təhsilimi davam etdirmək istəyirəm. Günah və üsyankarlıqdan uzaq, ağılla istəklərə qələbə çalan bir insan olmaq arzusundayam. Həyat yoldaşımın, onun ailəsinin və .qohum-əqrəbasının özü Allah bəyənən təfəkkürə malik olsun

Bəs necə bilim ki, həmin qadın bu şərtlərə malikdir? İnstitutda oxusam da, qızlarla yaxın münasibətdən çəkinirəm. İnanın ki, xəyalən belə bir insanı tapdığımı düşənəndə .rahatlıq bütün vücudumu bürüyür

Bu məsələnin həllində sizin rə'yinizi bilmək istəyirəm. Öz göstərişlərinizlə mənə kömək .göstərməyinizi xahiş edirəm

.CAVAB: Bismillahir-rəhmanir-rəhim

Sizin ətraflı məktubunuz çatdı. Bildiyiniz kimi ailə qurmaq mühüm dini ayindir. Həzrət Peyğəmbər (s) buyurur: «Ailə qurmaq mənim dinimdəndir (qaydalarımdandır). Başqa .bir hədisdə «evlənən şəxs dininin yarısını hifz edir» deyə buyurulur

Yəqin ki, bu dini ayini yerinə yetirmək fikrindəsiniz. Lakin həyat yoldaşını seçməkdə

həddi aşan götür-qoy vəsvəsədir. Əgər qadın iffətli, əxlaqlı tanınmışsa və valideynləriniz onu münasib bilirlərsə, Allaha təvəkkül etməklə işə başlayın və sizdən aslı olmayan işləri Allaha tapşırın. «Allaha güvənən kəslərə Onun yardımı yetərlidir» .((Təlaq-٣

**SUAL ٢٨**

!SUAL ٢٨: Həzrət Ayətullah-üzma Safinin hüzuruna. Salam

yaşım var. Üç aydır evlənmişəm. Bu müddət ərzində anlamışam ki, həyat yoldaşımın ٢٥ mənə qarşı münasibəti pisdir. Əsassız bəhanələrlə ayrılmaq istəyir. Ailə qurmazdan əvvəl bir oğlanla münasibətdə olduğunu e'tiraf edib. Faktlar da var – aşiqanə məktublar, telefon nömrələri... Çox nəsihət vermişəm. Ümid etmişəm ki, bəlkə islah oldu. Hətta ata-anasına bu barədə deyəcəyimlə onu hədələmişəm də. Öz imzası ilə .e'tirafını da aldım, amma tə'sirsiz oldu

Artıq iki həftədir ki, dava-dalaşına görə atası evinə aparmışam. Boşanmaq fikrindədir. Boşanmaq üçün istixarə etdim, yaxşı gəldi. İndi nə edim? Ağsaqqallara qulaq asım, ?yoxsa istixarəyə

Onun öz e'tirafına görə mənim mə'nəvi və maddi cəhətdən heç bir nöqsanım yoxdur. .Onun əxlaqındakı alçaqlığı valideynlərinə bildirməsəm pozğunluqla məşğul ola bilər

Üzr istəyirəm. Bütün məsələləri sizə açıq şəkildə çatdırmağı zəruri bildim. Xahiş .edirəm, nəzərinizi bildirəsiniz

.CAVAB: Bismillahir-rəhmanir-rəhim

.Ətraflı mə'lumatım olmadığım üçün sizin daxili işiniz haqqında rə'y verə bilmərəm

Əvvəla, bir nəfər üçün eyb olan sirri ifşa etməməyin savabı var. Bu iş zəruri olmasa, haram və günahdır. Ona görə də yoldaşınızın sirrini açmaqdan çəkinin. İkicisi, talaq kişinin əlindədir. Əgər qadın talaq vasitəsi ilə pis yola düşə bilərsə, mümkün olan halda .onu boşamamaq yaxşıdır. Ümumiyyətlə, halal işlərin ən pisi talaqdır

Üçüncüsü, ağsaqqalların məsləhətini dinləyib-dinləməməniz üçün şəraiti özünüz daha .yaxşı bilirsiniz. Hər halda mən də sizin çətinliyinizin həlli, xeyiriniz üçün dua edirəm

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər surəsi, ayə ۹

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ۲۰۰۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.۱

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.۲ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .۳ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.۱

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲
.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳
.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴
.Nəşriyyatın mənbələrini qeyd etmək.۵
.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir
:Müəssisənin fəaliyyəti
.Kitabların çapı və nəşri.۱
.Kitab oxumaq müsabiqələrinin təşkili.۲
.Məcazi sərgilərin istehsalı.۳
.Kompüter oyunlarının istehsalı.۴
Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵
.Sərgi məhsullarının və moizələrin istehsalı.۶
.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷
.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸
.Təlim kurslarının həyata keçirilməsi.۹
Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰
Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı
JAVA.۱
ANDROID.۲
EPUB.۳
CHM.۴
PDF.۵
HTML.۶
CHM.۷
GHB.۸
.v.Qaimiyyə kitab bazarı adına dörd market
ANDROID.۱
IOS.۲
WINDOWS PHONE.۳
WINDOWS.۴
deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik

:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹